# BU NÖMRƏDƏ

## DİLÇİLİK VƏ ƏDƏBİYYATŞÜNASLIQ



## METODİKA: TƏCRÜBƏ VƏ NƏZƏRİYYƏ



## ESSE...



*Cildin 1-ci səhifəsində: Xalq yazıçısı İsmayıl Şıxlı*

# SƏMƏD VURĞUN – ELM VƏ TƏHSİL YOLLARINDA

**Asif RÜSTƏMLİ,**
**filologiya elmləri doktoru, professor**

***Həmişə sən təsir altında qalmayıbsan,***
***sənin də təsirin altında qalmışlar.***
**Səməd Vurğun.**

Akademik, xalq şairi Səməd Vurğunun ömür yolunun, ədəbi-bədii yaradıcılığının davamlı olaraq Azərbaycan elminin, ədəbiyyatşünaslığının, ədəbi tənqidinin gündəmində saxlanılması, gündöyənində təzahür tapması təbiidir və müstəsna əhəmiyyət kəsb edir. Böyük sənətkar haqqında çoxsaylı monoqrafiyaların, biblioqrafiyaların, kitabların, elmi, ədəbi və publisistik əsərlərin, metodik vəsaitlərin nəşrinə baxmayaraq son iki ildə müxtəlif təyinatlı arxivlərdən əldə olunan sənədlər, materiallar təsdiqləyir ki, S.Vurğunun təhsili, ictimai fəaliyyəti ilə bağlı ziddiyyətli, kölgəli, mübhəm məqamlar mövcuddur və bu problemlərin çözümünə, fərqli faktların, tarixlərin dəqiqləşdirilməsinə ciddi ehtiyac vardır.

Azərbaycan Milli Kitabxanasının Səməd Vurğunun 110 illiyi münasibətilə nəşr etdirdiyi biblioqrafiya (tərtib edənlər: Mədinə Vəliyeva, Mətanət İbrahimova, Lalə Şirinova və Gülbahar Misirova. Bakı, 2016) çoxillik səmərəli axtarışların, böyük zəhmətin müqabilində yaradılmış zəngin xəzinə, möhtəşəm abidə və sanballı elmi işdir. Burada sevimli şairimizin həyat və yaradıcılığı ilə sıx bağlı olan çoxsaylı yeni faktlar, məlumatlar, qaynaqlar öz əksini tapmışdır. Hətta biblioqrafiya ilə viziual tanışlıq mülahizə yürütməyə əsas verir ki, Azərbaycan alimlərinin, ədiblərinin ön cərgəsində dayanan, Səməd Vurğun qədər zəngin biblioqrafiyaya malik ikinci şəxsi müəyyənləşdirmək müşkül məsələdir. Tərtibçilərin böyük zəhmətini minnətdarlıq duyğusu ilə vurğulamaqla yanaşı, həqiqət naminə diqqətə çatdırılmalıdır ki, "Səməd Vurğun. Biblioqrafiya"sı zəngin olsa da, təəssüf ki, mükəmməl deyildir. Bəlkə də, məhz bu ehtimala əsaslanaraq tərtibçilər haqlı olaraq xatırladırdı: "Gös-tərici haqqında rəy və təkliflərini bildirən mütəxəssislərə və oxuculara əvvəlcədən minnətdarlığımızı bildirərək, təklif və rəylərini M.F.Axundov adına Milli Kitabxanaya göndərmələrini xahiş edirik" (Səməd Vurğun. Biblioqrafiya, Bakı, 2016, səh.3).

S.Vurğunun müxtəlif illərdə yazıb imzaladığı tərcümeyi-hallarda, anketlərdə, materiallarda göstərilən tarixi faktlarla biblioqrafiya arasında ciddi fərqlər, uyğunsuzluqlar mövcuddur. Məsələn, biblioqrafiq göstəricidə Səmədin ilk təhsil illəri ilə bağlı qeyd edilir: "1913-1918 - Yuxarı Salahlı kəndində "Zem-

skaya şkola" adlanan beşsinifli rus-tatar məktəbində təhsil alıb" (göstərilən mənbə, səh. 23). Bu tarix digər, daha mötəbər elmi qaynaqda - böyük ədibin 1943-cü il 9 avqustda doldurub imzaladığı "Kadr uçotu üzrə şəxsi vərəqə"də "Salahlı kənd 1-ci dərəcəli, üçsinifli məktəbdə 1914-1917-ci illərdə oxuduğu" (AMEA RH Arxivi, fond-39, iş-78, qutu-100, səh.-9) qeyd edilmişdir. Müqayisə apardıqda sənəddən məlum olur ki, S.Vurğun 7 yaşında yox, məhz 8 yaşında, "Zemskaya şkola" adlanan beşsinifli rus-tatar məktəbinə" deyil, "Birinci dərəcəli, üçsinifli Salahlı kənd məktəbi"nə gedərək ibtidai təhsilini doğma kəndində almışdır. Biblioqrafiyada öz əksini tapmasa da, vurğulanan anketdə Səməd Vurğun 1924-cü ildə "Mətbuat İşçiləri İttifaqının" üzvü, 10 yanvar 1947-ci ildə yazdığı tərcümeyi-halında isə Azərbaycan – İran Mədəni Əlaqələr Cəmiyyəti Rəyasət Heyətinin sədri olduğu qeyd edilmişdir ki, bu informasiyalar da şairin həyatını, ictimai fəaliyyət sferasını öyrənmək istəyənlər üçün çox dəyərli ola bilər.

Səməd Vəkilovun arxivlərdən əldə etdiyimiz, 1929-cu il 2 mart tarixində yazdığı, indiyədək kölgədə qalan tərcümeyi-halı bir neçə baxımdan maraq kəsb etdiyi üçün dilinə, üslubuna toxunmadan təqdimata ehtiyac duyulur: "Tərcümeyi hal. Mən, aşağıda imza atan Səməd Vəkilof 1906-ncı ildə Qazax qəzasının Salahlı kəndində təvəllüd etmişəm. İbtidai təhsilimi kənt məktəbində görərək, 1924-cü ildə Qazax Pedaqoji Texnikumunu bitirib, Qazax, Quba, Bakı, Gəncə şəhər və kəntlərində müəllim olaraq çalışmışam. Hal hazırda Gəncə Türk Şura Firqə məktəbinin lisan və ədəbiyyat müəllimiyəm. 20-nci ildən bəridir ki, Lenin Kommunist Gənclər İttifaqı Şurasında çalışıram. Atam Yusif ağa Vəkilof bəy nəslindəndir. O, Çar zamanında heç bir xidmətdə bulunmamışdı. Olduqca yoxsul olduğundan nökər və muzdur işlətməmişdir. Onun son vəzifəsi Qazax Pedaqoji Texnikumunda məktəb xidmətçisi olmuşdur. Çocukluğum və gəncliyim yoxsulluq və aclıq içində keçmişdir."

Tərcümeyi-halın son cümləsi insan qəlbini riqqətə gətirsə də, "Atam Yusif ağa Vəkilof bəy nəslindəndir" – ifadəsi gənc Səmədin hələ qırmızı rejimin iç üzünü yetərincə tanımadığını, bu fikrin onun gələcəyi üçün ciddi maneələr yarada biləcəyindən xəbərsiz olduğunu göstərir. Onu da qeyd edək ki, Qazax Qəza İcraiyyə Komitəsinin sədri H.Əfəndiyev 2 mart 1929-cu ildə Salahlı sakini Səməd Vəkilovun əl ilə, latın əlifbasında yazdığı tərcümeyi-halını imzası və möhürü ilə təsdiqləmişdir. Sənəd şairin ömür yolunun tədqiqi baxımından əhəmiyyətlidir.

"Səməd Vurğun. Biblioqrafiya"sında S.Vəkilovun Moskvada hansı ali məktəbdə və nə zaman təhsil aldığı barədə yazılıb: "1929-1931 - İkinci Moskva Dövlət Universitetinin Ədəbiyyat və dil şöbəsində təhsil alıb (göstərilən mənbə, səh. 23).

Etiraf edək ki, bu məlumata böyük sənətkarın həyat və yaradıcılığından bəhs edən əksər elmi qaynaqlarda istinad olunub. S.Vurğunun yazdığı və imzaladığı tərcümeyi-hallarda, anketlərdə bu fakt biblioqrafiyada olduğu kimi verildiyi üçün əslində şübhə də doğurmurdu. Lakin, arxivdən üzə çıxardığımız bir mötəbər sənəd Səməd Vurğunun İkinci Moskva Dövlət Universitetində deyil, fərqli adda olan bir ali məktəbdə -

Moskva Dövlət Pedaqoji İnstitutuda oxuduğunu təsdiqləyir. Həmin mötəbər sənədin faksimilesini və Azərbaycan dilində tərcüməsini təqdim edirəm: "Moskva Dövlət Pedaqoji İnstitutu. 11/VII 1931, № 10/9/1. Moskva, M.Piroqovskaya, 1. Tel. 2-26-34.

Arayış verilir ədəbiyyat şöbəsinin hazırda II kurs tələbəsi yol. Vəkilov S(əməd). U(sub oğluna). Ona görə ki, Pedinstitutda olduğu 29/30-cu təhsil ilindən 1931-ci təhsil ilinədək MDPİ 1 və 2-ci kursun bütün (aşağıdakı) fənlərindən imtahan vermişdir.

1. Siyasi iqtisad. 2. Tarixi materializm. 3. Pedaqogika. 4. Pedelogiya (nəzarətçi). 5. Psixologiya. 6. Ədəbiyyatşünaslığa giriş. 7. Ümumi dilçilik. 8. XIX əsr rus ədəbiyyatı. 9. XX əsr rus ədəbiyyatı. 10. Müasir rus dili. 11. Dialektik materializm. 12. Partiya tarixi. 13. Rus dilinin metodikası. 14. Rus ədəbiyyatının metodikası. 15. Poetika. 16. Kənd təsərrüfatının əsasları. 17. Folklor. 18. Siyasi məşğələ saatı. 19. Hərbi intizam: a) hərbi-kimyəvi iş, b) taktika, I hissə, v) atıcılıq işi I və II hissə. Tədris hissə müdiri."

Arayışa basılan möhürdə: "RSFSR Xalq Maarif Komissarlığı Moskva Dövlət Pedaqoji İnstitutu" sözləri yazılmışdır.

Səməd Vəkilova 11 iyul 1931-ci ildə verilən rəsmi arayışdan bəlli olduğu kimi o Moskva Dövlət Pedaqoji İnstitutunda oxumuş, 2-ci kursdan isə Pedinstitutu yarımçıq tərk edərək Bakıya qayıtmışdır. Ali təhsil ocağının fərqli adı ilə bağlı araşdırma apararkən məlum olmuşdur ki, İkinci Moskva Dövlət Universiteti 1918-ci il 16 oktyabr tarixində RSFSR Xalq Maarif Komissarlığının qərarı ilə yaradılmış, həmin qurumun 1930-cu il 18 aprel tarixli 234 saylı əmrilə ləğv edilmiş, onun bazası əsasında üç müstəqil ali təhsil müəssisəsi təsis olunmuşdur. 1930-cu il aprel ayında ləğv edilmiş İkinci Moskva Dövlət Universiteti Pedaqoji fakültəsinin bazasında Moskva Dövlət Pedaqoji İnstitutu fəaliyyətə başlamışdır. Beləliklə aydın olur ki, Səməd Vurğun 1929-cu ildə İkinci Moskva Dövlət Universiteti Pedaqoji fakültəsinin ədəbiyyat şöbəsinə daxil olmuş, ikinci kursu isə yeni yaradılmış Moskva Dövlət Pedaqoji İnstitutunda başa vurmuşdur. Güman edirəm ki, S.Vurğunun həyatından, Moskva dövrü təhsilindən söz açan müəlliflər "İkinci Moskva Dövlət Universiteti" sözbirləşməsinin əvvəlində "sabiq" və ya "keçmiş" sözünü yazmağı unutmamalı, Moskva Dövlət Pedaqoji İnstitutu adını isə mütləq qeyd etməlidilər.

Səməd Vurğun Vəkilov 11 iyul 1931-ci ildə Moskva Dövlət Pedaqoji İnstitutundan təhsil haqqında arayış aldıqdan iki həftə sonra Azərbaycan Dövlət Elmi Tədqiqat İnstitutunun (Az.DETİ) aspirantura şöbəsinə daxil olmaq üçün əsl mübarizəyə başlamış, qəbul komissiyası üçün müxtəlif təşkilatlardan müvafiq sənədlər toplamışdır. Az.DETİ-nin qəbul komissiyasına ilk müraciəti 24 iyul 1931-ci ildə Azərbaycan Kommunist Gənclər İttifaqı Mərkəzi Komitəsi Təhsil və məişət şöbəsinin müdiri Məcidov etmiş, komsomolun üzvü Vəkilov Səməd Yusif oğlunu institutun "ədəbiyyat şöbəsinə" qəbulunu tövsiyə etmişdir. Ertəsi gün, iyulun 25-də 273 saylı məktubla Az.DETİ rəhbərliyinə Azərbaycan Proletar Yazıçılar Cəmiyyəti (Az.PYC) kommunist fraksiyasının katibi müraciət etmiş, cəmiyyətin fəal üzvü, ədəbi-bədii əsərlər müəllifi Səməd Vəkilovun Az.DETİ Ədəbiyyat şöbəsi üzrə

aspiranturasının 1-ci əsas kursuna qəbul olunasının təmənnasında olduğunu bildirmişdir.

Azərbaycan Proletar Yazıçılar Cəmiyyətinin katibi Mehdi Hüseynovun (Mehdi Hüseyn.-A.R.) və İşlər idarəsi müdiri Pavlovun imzaladıqları Səməd Vurğun haqqındakı xasiyyətnamədə yeni faktlar olduğu üçün tam şəkildə təqdim etməyə ehtiyac duyulur. Sənəddə yazılır: "Xasiyyətnamə. Səməd Vurğun Vəkilov 1927-ci ildən Azərbaycan Proletar Yazıçılar Cəmiyyətinin üzvüdür. Bu müddət ərzində Səməd Vurğun cəmiyyətin işində çox fəal iştirak etmiş, Az.PYC-nin Gəncə şöbəsinin rəhbəri olmuşdur. Az.PYC yoldaş Səməd Vurğunu təhsil almaq üçün Moskvaya, 2-ci MDU-ya göndərmiş və o, oranı bitirmişdir.

Az.PYC yoldaş Səməd Vurğunu yoxsul ailədən çıxmış fəal, təmkinli və ciddi komsomolçu kimi tanıyır. Az.PYC-n katibliyi Səməd Vurğun Vəkilovun Az.DETİ-də təhsil almağını tövsiyə edir".

S.Vurğunun 1927-ci ildən yazıçılar cəmiyyətinin üzvü olduğu və 1929-cu ildə məhz bu təşkilatın göndərişi ilə Moskvaya təhsil almağa getməsi tamamilə yeni, diqqəti cəlb edən və biblioqrafiyada öz əksini tapmayan məlumatlardır.

"Daşdan keçən" sənədləri bir qovluğa toplayan gənc Səməd 25 iyul 1931-ci ildə Türk Mədəniyyət Sarayında (indiki AMEA Rəyasət Heyətində) yerləşən Azərbaycan Dövlət Elmi Tədqiqat İnstitutuna üz tutdu. İnstitutun qəbul komissiyasına ünvanladığı ərizəsində S.Vəkilov yazırdı: "Az.DETİ-nin qəbul komissiyasına. Səməd Vəkilovdan ərizə. Xahiş edirəm məni Az.DETİ-nin Ədəbiyyat şöbəsi üzrə aspiranturasının 1-ci əsas kursuna qəbul edəsiniz. Qəbul üçün bütün lazımi sənədləri təqdim edirəm. İmza, Səməd Vəkilov, 25/VII-31 il."

İnstitutun direktor müavini, Ədəbiyyat və Dil Bölməsinin rəhbəri, professor Vəli Xuluflu iyulun 27-də Səməd Vurğunun ərizəsinə dərkənar qoydu: "Buraxılsın!" Əslində bu qeyd gənc ədəbiyyatşünasın aspirantura imtahanlarına buraxılması üçün verilən göstəriş idi. Az.DETİ-nin Ədəbiyyat şöbəsi üzrə aspiranturasına qəbul imtahanları 1931-ci ilin sentyabr ayında baş tutdu. İnstitutun Səməd Vəkilova verdiyi rəsmi cavab isə məyusedici idi. İmtahanların nəticəsinə aid verilən arayışda yazılırdı: "Azərbaycan Mərkəzi İcraiyyə Komitəsi yanında Azərbaycan Elmi Tədqiqat İnstitutu. 23 sentyabr 1931-ci il, № 061/4/52. Bakı şəh. **Arayış** verilir yoldaş Vəkilov Səmədə ona görə ki, o növbəti fənnlər üzrə imtahan verdi: partiya tarixi, Qərb dövlətlərinin tarixi, dialektik materializm, siyasət, türk və rus dili... Sosial mənşəyinə görə aspiranturaya qəbul edilmədi. Az.DETİ Tədris hissəsinin katibi Vilçevski."

Tərcümeyi-halında böyük səmimiyyətlə yazdığı: "Atam Yusif ağa Vəkilof bəy nəslindəndir" cümləsi Səməd Vəkilovun elmə gedən yolunda ciddi maneəyə çevrildi. Az.DETİ-nin müvəqqəti direktoru Gevorkov tədris hissə katibi Vilçevskinin vasitəsilə qərəz, kin-küdurət nümayiş etdirirdi. S.Vurğunun üzv olduğu nüfuzlu təşkilatlar müraciətlərinin urvatsız qarşılanması ilə barışmağa hazır deyildilər. Hələ Gəncədə işlədiyi illərdən Səməd Vəkilovu yaxından tanıyan professor Vəli Xuluflu da təmsil olunduğu institutun lüzumsuz qərarına qəti etirazını bildirdi. Beləliklə, çətinliklə də olsa

S.Vurğun Az.DETİ-nin aspiranturasına bərpa edildi.

Səməd Vurğunla eyni vaxtda onun yazıçı dostlarından Mir Cəlal Paşazadə (O zaman Mir Cəlal müəllimin soyadı Paşazadə idi. – A.R.) və Mirzə İbrahimov da təhsillərini bu tədqiqat ocağında davam etdirirdilər. Azərbaycan Dövlət Elmi Tədqiqat İnstitutu Ədəbiyyat və dil bölməsinin 1932-ci il 6 iyun tarixli iclasında Vəli Xuluflunun sədrliyi ilə komissiya aspirantlardan imtahan götürərək aşağıdakı qərarı qəbul etdi: "***II kursa keçirilsin***: 1.Vəkilov Səməd, 2.Paşazadə Mir Cəlal, 3.İbrahimov Mirzə, 4.Nəsirli Y., 5.Məmmədov Ağasi. ***Çıxarılsın***: Həsənzadə Pəri və Kərimova Q. ***MK-ya göndərilsin***: Jamkoçan" (AR Dövlət Arxivi, fond-387, siyahı-1, saxlama vahidi-107).

İkinci kursa keçən aspirantlar imtahanları uğurla versələr də, mövcud institutda təhsillərini davam etdirmək onlara qismət olmadı. Çünki, Azər-baycan Dövlət Elmi Tədqiqat İnstitutu 1932-ci il iyulun 16-da ləğv edilir, onun Ədəbiyyat və dil bölməsinin bazasında Azərbaycan Dil, Ədəbiyyat və Sənət İnstitutu (Az.DƏSİ) yaradılır. Azərbaycan Xalq Maarif Komissarlığı Kollegiyasının 1932-ci il 29 iyul tarixili 33 saylı protokolunda yazılırdı: "Dil, Ədəbiyyat və Sənət İnstitutunun yaradılması haqqında. Dil sahəsində (terminologiya, orfoqrafiya, lüğət işi, türk dilinin qramatikası və Azərbaycanda milli azlıqların dili) işlərin inkişafı, Azərbay-can ədəbi dilinin, ədəbiyyatının və incəsənətinin əsas məsələlərinin konkret inkişaf yolunun işlənilib hazırlanması, eləcə də Xalq Maarif Komissarlığı yanında (Elm sektoru üzrə) yüksək dərəcəli, siyasi cəhətdən hazırlıqlı redaktorların, tərcüməçilərin yetişdirilməsi məqsədilə sabiq Az.DETİ-nin Ədəbiyyat və Dil Bölməsinin bazası əsasında Azərbaycan Dil, Ədəbiyyat və Sənət İnstitutu (Az.DƏSİ) təşkil edilsin. 2. Yalnız dil və ədəbiyyat sahəsi üzrə aspirantura saxlanılsın, onların fəaliyyəti institutun istehsalat işi ilə əlaqələndirilsin. 3. Elm sektoru on gün müddətində institut haqqında əsasnaməni tərtib etsin. Vəli Xuluflu direktor vəzifəsini müvəqqəti icra edən təyin olunsun."

Professor Vəli Xuluflunun rəhbərlik etdiyi Azərbaycan Dil, Ədəbiyyat və Sənət İnstitutu (Az.DƏSİ) tədqiqat və təhsil yönümlü idi. 1932-ci ildə Az.DƏSİ-də 22 nəfər əməkdaş çalışırdı. İnstitutun tədris hissə müdiri Q.P.Firidolin, məsul katib N.V.Minkeviç təyin edilmişdi. Azərbaycan Dil, Ədəbiyyat və Sənət İnstitutunda Əli Nazim (ədəbiyyat şöbəsinin müdiri), Qulam Bağırov (dil şöbəsinin müdiri), Hüseyn Cavid (ədəbiyyat şöbəsinin məsləhətçisi), Ələsgər Ələkbərzadə (ədəbiyyat şöbəsinin elmi işçisi), İdris Həsənov (redaktor), Yusif Əliyev (redaktor), Abdulla Tağızadə (dil nəzəriyyəsi seksiyasının müdiri), Paşa Sultanov (tərcüməçi), Liliya Vəkilova (redaktor köməkçisi) və b. (AR DA fond-57, siyahı-1, iş-1002) tanınmış ədəbi simalar fəaliyyət göstərir, aspirantlarla birbaşa təmasda olurdular. Faktlar təsdiqləyir ki, digər aspirant həmkarları kimi Səməd Vurğun da Az.DETİ-nin ləğvindən sonra təhsilini Azərbaycan Dil, Ədəbiyyat və Sənət İnstitutunun aspiranturasında davam etdirir. İnstitut hətta as-

pirantlara ayda 170 manat təqaüd də verirdi. Səməd Vurğunun aspirant təqaüdünün artırılması xahişi ilə yazdığı, arxivdən üzə çixardığımız unikal bir sənəd dövrün və mühitin əhval-ruhiyyəsini əks etdirmək baxımından maraq doğurur. 1932-ci il 7 oktyabrda qələmə alınan ərizədə gənc aspirant yazırdı: "Az.DƏSİ-nin təqaüd komissiyasına. Ədəbiyyat şöbəsinin II kurs aspirantı Səməd Vurğundan ərizə. Mən baxmayaraq ki, heç bir yerdə işləmirəm və təyin edilmiş 170 manat miqdarında təqaüdlə yaşayıram – bu məbləğ məni təmin etmir. Bundan əlavə mənzil, işıq, təmizlik üçün vəsait ödəyirəm. Xahiş edirəm mənə 280 manat miqdarında təqaüd və komunal xərclərini ödəyəsiniz. Əgər İnstitut göstərilən məbləği mənə ödəməkdən çəkinsə təhsilimi davam etdirmək imkanı olmayacaq. Səməd Vurğun. 7/X-32."

Aspirant Səməd Vurğunun təqaüdlə bağlı ərizəsinə müsbət cavab verilməsi haqqında səhih məlumata malik deyilik. Amma o fakt dəqiq məlumdur ki, Azərbaycan Dil, Ədəbiyyat və Sənət İnstitutu 1932-ci il 22 dekabr tarixli qərarı ilə özü öz fəaliyyəti dayandırır və bütün əmlakı yeni yaradılan SSRİ Elmlər Akademiyası Zaqafqaziya Filialının Azərbaycan şöbəsinə (Az.OZFAN) təhvil verilir. Beləliklə Azərbaycan Dövlət Elmi Tədqiqat İnstitutunun ikinci kursa keçən aspirantlarından yalnız Mir Cəlal təhsilini Ali Pedaqoji İnstitutda sonadək davam etdirdi. Aspirant Səməd Vəkilovun da sənədləri APİ-yə göndərilsə də, bir müddətdən sonra o elmə doğru gedən yolunu dəyişib bütün enerjisini, istedadını bədii yaradıcılığa, poeziyaya sərf etmək istiqamətini seçir. Böyük ədib 1945-ci ilin mart ayının 27-də Azərbaycan Elmlər Akademiyasının təsisçisi və həqiqi üzvü seçilənədək məşhur şair və ictimai xadim kimi tanınırdı. Səməd Vurğun bu vaxtadək on şeir kitabının müəllifi, iki dəfə SSRİ Dövlət (Stalin) mükafatı laureatı, əməkdar incəsənət xadimi, SSRİ və Azərbaycan Ali Sovetinin deputatı idi. Onun Akademiyaya yolunun qısa və kəsəliyində ədəbiyyatımız qarşısındakı xidmətlərinin və mükafatlarının rolu mühüm və şübhəsizdir.

Hələ 1941-ci ilin yanvar ayının 9-da onu SSRİ EA Azərbaycan Filialından (sədr müavinləri Əhəd Yaqubov və Heydər Hüseynovun imzası ilə) "SSRİ xalqları folklor külliyyatı" seriyası üzrə redaksiya heyətinə Azərbaycandan üzv seçilməsi mühüm hadisə idi. Səməd Vurğun Akademiya divarları arasında Azərbaycan ədəbiyyatına, klassiklərə həsr edilmiş bütün konfranslarda, elmi sesiyalarda, ədəbi müzakirələrdə çıxış və məruzələri ilə fəal iştirak edirdi. 1945-ci il mart ayının 31-də birinci ümumi iclasda Mir Əsədulla Mir Qasımov Azərbaycan EA-nın prezidenti, Heydər Hüseynov və Şamil Əzizbəyov vitse-prezident, Mirəli Qaşqay isə akademik-katib seçildilər. Azərbaycan EA Rəyasət Heyətinin ilk iclası isə 2 aprel 1945-ci ildə keçirildi. Gündəlikdə isə prezident, vitse-prezidentlər və akademik-katib arasında vəzifə bölgüsü məsələsi dururdu. Vitse-prezident Heydər Hüseynova həm də İctimai Elmlər Bölməsinin rəhbəri vəzifəsi həvalə olundu və akademik Səməd Vurğun da bu bölməni təmsil edirdi. Akademiya Rəyasət Heyətinin 1 iyun tarixli iclasında İctimai Elmlər Bölməsinin plan işinə baxılması və təsdiqi gündəliyə gətirildi. Heydər Hüseynov ictimai elmlər sahəsi üzrə geniş

məruzə etdi. Azərbaycan ədəbiyyatı tarixinin altıcildliyi və klassiklərin əsərlərinin çapa hazırlanması məsələlərinə ciddi toxunuldu. Vitse-prezident Heydər Hüsey-novun sədrliyi ilə 10 iyun 1946-cı ildə keçirilən elmi sesiyada isə Həmid Araslı və Məmməd Arif Dadaşzadə "Azərbaycan ədəbiyyat elminin genişlənməsi və gələcəyi haqqında" adlı maraqlı məruzə etdikdən sonra Sadıq Dadaşov, Həbibulla Səmədzadə, Yusif Mirbabayev toxunulan mövzuya geniş və hərtərəfli münasibət bildirdilər. Səməd Vurğunun çıxışı isə indiyədək çap olunmadığı üçün üslubuna toxunmadan, olduğu kimi təqdim edirik: "Səməd Vurğun: - Yoldaşlar, mən ümumiyyətlə bu skeptizmə və skeptik adamlara həmişə bir növ düşmənəm. Eyni zamanda, ən böyük ədəbiyyat və elm odur ki, o həmişə öz qarşısında böyük məsələ qoyar, yəni elə bir tədqiqat mən istəyirəm ki, o tədqiqat prosesində mən alimin bu və ya digər inqilabi və yeni proqressiv elmi bir fikri ilə də tanış olum.

Bizim gənc ədəbiyyatşünaslarımız ədəbiyyatın yaradılması uğrunda da az iş görməmişdilər. Lakin görüləcək işlərin çoxu qarşımızda durur. Məsələn mən özüm də təsəvvür edə bilmirəm ki, əgər bizim elmi tariximiz hələ kamilən yaradılmamışdırsa, bizim ədəbiyyat tariximiz necə yaradıla bilər? Atılan addımlar çox geridədir. Ancaq mən demək istəyirəm ki, ədəbiyyat ilə fəlsəfə arasında məna vəhdəti yaratmaq lazımdır ki, bunlar bir-birini tamamlaya bilsin.

Mən "Vaqif"ı yazanda əhvalat necə oldu, Qacar necə gəldi, İbrahim xan necə oldu – bunu bilirdim. Ancaq sonralar ədəbiyyat artdıqca, yeni-yeni məlumat olduqca adam yaratdığının bəzisinə peşiman olur. İndi bizim tariximizi yaratmalıyıq. Ədəbiyyatımız bir çox təhriflərə və səhvlərə yol verməsin.

Mən ədəbiyyatşünaslıqda əsas nöqsanı nədə görürəm?! Şəxsən məni maraqlandıran odur ki, mən hər iki məruzəçiyə (Həmid Araslı və Məmməd Arif Dadaşzadə nəzərdə tutulur. - A.R.) diqqətlə qulaq asdım. Əlbəttə bunlar bizim gözəl, görkəmli alimlərimizdir. Ancaq yoldaş Araslı ədəbiyyatşünaslığa aid … (klassiklər haqqında məlumatlar verdi). Mən istərdim ki, bunun özü elmi bir əsər olaraq verilsin. Hansı epoxada, hansı ədəbiyyatşünas nə kimi xarakter daşıyırdı və indi nə kimi xarakter daşıyır. O dövrün alimi, onun xasiyyəti, ədəbiyyatın mənəvi xüsusiyyətləri, o dövrün mənəvi xüsusiyyətləri olmalıdır…

Bu cür "obzor" (icmal) vermək şəxsən məni kifayətləndirmədi. Ümumiyyətlə ədəbiyyatşünaslıq varmı? Mənə elə gəlir ki, bizim ədəbiyyatçılarımızın səhvi odur ki, hamısı ümumiyyətlə ədəbiyyatşünas olmaq istəyirlər. Ancaq mən elə ədəbiyyat(çı) tanımıram ki, elmə baxışı məhz bir olsun. Məsələn, füzulişünas, axundovşünas, vaqifşünas, Cəfər cabbarlışünas. Rusiyada bu təsnifat vardır. Məsələn mən Füzulini bilirəm, Axundovu bilirəm. Əgər ədəbiyyatşünas mən qədər biləcəksə, onda onunla mənim aramda heç bir fərq qalmır. Ədəbiyyatşünas gərək 20-30 il bununla məşğul olsun. O zaman Füzulişünas əsl mənasında meydana çıxar. Füzuliyə böyük, dahi sənətkar deməklə, onun dahiliyi meydana çıxmaz. Məncə Akademiya belə iş aparmalıdır; müəyyən adamlarınız ədəbiyyatşünaslıqla məşğul olmalıdır. Məsələn, deyək bizim tariximizdə romantizm cərəyanı nə

vaxt başlamışdır, kimdən gəlmişdir. Həmçinin realizm nə kimi tarixi dövr keçmişdir. Bu sahədə ayrı-ayrı əsərlər yaradılmalıdır.

Yaxud ikinci məsələ: deyək ki, biz Nizamidən danışırıq. Nizamidən danışarkən ədəbiyyatımızın böyüklüyünü göstərmək üçün hansı alim xüsusilə məşğul olur?! Deyək ki, "Nizami və qədim yunan ədəbiyyatı", yaxud fəlsəfəsi. Ya da götürək "İran və dünya ədəbiyyatşünaslığı", o cümlədən "Rusiya ədəbiyyatşünasları" – həmişə birinci plana İran mədəniyyətini salsalar yaxşı olmazmı? Bizim ədəbiyyatşünaslar dissertasiya yazsın. Məsələn, biri belə bir qəhrəmanlıq edə, götürə "Azərbaycan ədəbiyyatının İran ədəbiyyatına təsiri", lap Nizami dövründən tutmuş indiyə qədər, müasir ədəbiyyata qədər. Belə bir əsərlə bütün dünyaya ədəbiyyatşünaslığı tanıtmış olarsan. Çünki həmişə sən təsir altında qalmayıbsan, sənin də təsirin altında qalmışlar. Məsələn, Axundova, Molla Nəsrəddinə (Cəlil Məmmədquluzadəyə-A.R.) Nizaminin təsiri azmı olmuşdur, yaxud Şərq ədəbiyyatının təsiri azmı olmuşdur?! Belə cəsarətli elmi əsərlər yaradılmalıdır ki, bu mübahisəli məsələlər birdəfəlik ortadan götürülsün. Bizim müasir ədəbiyyatımıza aid məncə bu tarixi şəxsiyyətlərimizi qaldırmaqla bərabər, müasir ədəbiyyatımızın tarixinə yeni bir nəzərlə baxmalıyıq. Yeni elm və eyni zamanda ədəbiy-yatın yaradıcılıq, inkişaf prosesinə gərək kömək etsin.

Çox vaxt bizim yoldaşlar tənqid ilə ədəbiyyatşünaslıq məsələlərini qarışdırırlar. Mən bununla razı ola bilmərəm. Məsələn deyirlər Səməd Vurğun tənqid yazır. O mənim baxışımdır, mən orada düz də deyə bilərəm, səhv də deyə bilərəm. Məsələn Hüseyn Mehdi tənqid yazır. Bunun elmə nə dəxli vardır?!

Mən demək istəyirəm ki, gərək biz seçək; elm haradan başlayır, tənqid haradan başlayır? Bu sahədə bir növ belə xaos – qarışıqlıq vardır…

Mən istəyirəm ki, bizim elm, ədəbiyyata istiqamət verə bilsin. Məsələn, Həmid Araslı yoldaş XIX əsr (stenoqrafçı yanlış yazıb, orta əsrlər olmalıdır. -A.R.) ədəbiyyatında çox iş görmüşdür. Ancaq gərək o gözəl material verə, gərək gözəl əsər yarada. Nə vaxt Araslı yoldaş Füzuli və yaxud Şah İsmayıl Xətai haqqında müəyyən gözəl bir əsər verəcəkdir. Gərək o elə olsun ki, gələcəkdə elmi akademik olsun. Daha mənim kimi yarımçıq akademik yox (gülüşmə).

Yeni istiqamət verməkdən çox şey asılıdır. Mən burada iki konkret təklif irəli sürürəm: birinci – bizim institutumuz gərək … (ixtisaslaşma məsələsini. -A.R.) irəli sürsün, yəni Füzulişünaslıq yaradılsın. Məsələn, Moskvada rus poeziyasından Vətənə aid olan ən kiçik şeirlər (toplusu) yaradılmışdır. Bu şeir kimi görünür, ancaq eyni zamanda ədəbiyyat tarixini, Vətən tarixini 200 illik bir şeirdə gözəl nümayiş etdirmişdir" (AMEA RH Arxivi, fond-7, siyahı-1, iş-703, qutu-61, səh.-103-106).

Nizami adına Ədəbiyyat İnstitutunun perspektiv planının müzakirəsində akademik Səməd Vurğunun toxunduğu məsələlər mürəkkəb, ziddiyyətli ictimai-siyasi mühitdə cəsarət və məsuliyyət tələb edən aktual problemlərdir. Onun ədəbiyyatın müxtəlif sahələri üzrə kadrların ixtisaslaşması, ədəbiyyatşünaslığın tarix, fəlsəfə elmləri ilə qarşılıqlı əlaqə problemləri, ədəbi cərəyanların – xüsusilə romantizmin və realizmin sis-

temli araşdırılması, Azərbaycan ədəbiyyatının İran ədəbiyyatına, Şərq ədəbiyyatına təsiri məsələləri, ədəbi mühit və ədəbiyyat tarixinə yeni baxış sistemi milli ədəbiyyatşünaslıq elmimizin konseptual proqramının tərkib hissələri kimi dəyərləndirilməlidir.

Akademik Səməd Vurğunun Azərbaycan Elmlər Akademiyasında 1947-ci il 3 noyabr tarixli elmi sesiyasında məruzəçi Məmməd Cəfər Cəfərovla dialoqu da, ədəbiyyatşünaslıq baxımından diqqət çəkir. İclasa sədrlik edən vitse-prezident, professor Heydər Hüseynov "Azərbaycan sovet dramaturgiyasının inkişafı yolları haqqında" adlı mövzuda məruzə etmək üçün Məmməd Cəfər Cəfərova söz verir. Məruzədən sonra sesiya iştirakçıları ona tənqidi ruhlu suallar verir. Müzakirədə fəallıq göstərənlərin biri də Səməd Vurğundur. Dialoq qaşılıqlı hörmət şəraitində davam etmiş, bir sıra mətləblərə açıq münasibət bildirilmişdir.

"Səməd Vurğun: - Fəhlə tematikası (mövzusu) bizim dildə zəifdi. Mən bu məsələni "teoretiçeski" (nəzəri cəhətdən) aydınlaşdırmaq istəyirəm. Bunun səhvi nədədir? Nə üçün fəhlə obrazını yazmırlar? Bunu yazıçının münasibətində görmək lazımdır? Hansı münasibət olursa-olsun biz bunu "teoretiçeski" aydınlaşdırmalıyıq.

M.C.Cəfərov: - Bunu böyük vətən bizdən tələb edir. Bizim yaxşı obrazımız vardır, fəhlə hərəkatından "Xanlar"da…

Səməd Vurğun: - O keçmiş həyatdandır.

M.C.Cəfərov: - "1905-ci ildə", həmçinin orada fəhlə həyatından vardır, Bakı fəhləsi orada rəhbərlik edir. Orada fəhlə vardır, amma qalan əsərlərdə fəhlə yoxdur. Bizim əsərlərdə, istehsalatda fəhlə rolları yoxdur.

Səməd Vurğun: - Moskvada böyük zavodlar vardır, orada olan istehsalatdan göstərmək lazımdır.

M.C.Cəfərov: - Cəfər Cabbarlı fəhləni istehsalatda göstərir.

Səməd Vurğun: - Orada nə vardır, "oçerkovoy" bir şeydir. Mən demək istəyirəm ki, fəhlə sınfından artıq yazmaq və göstərmək lazımdır.

Heydər Hüseynov: - Ədəbiyyat məsələsində bir sıra mürəkkəb, çox mühüm məsələlər vardır ki, biz onu bir-iki gündə həll edə bilmərik. Bu yaxın vaxtlarda bir neçə günlük iclas aparmalıyıq ki, orada bunları həll edə bilək. Həyat sadə deyil, həyat çox müxtəlif və (hadisələrlə) zəngin, xüsusən indiki zamanda beynəlxalq siyasət məsələsini necə burada Səməd Vurğun göstərmişdi, bunu aydınlaşdırmaq lazımdı" (AMEA RH Arxivi, fond-7, siyahı-1, iş-393, qutu-36, səh.-195-196).

Nəzəriyyəçi alimlə görkəmli şairin dialoqu sənət və sənətkarlıq məsələlərinin dərin qatlarına hesablanıb. Müharibə milyonlarla insanın, gəncin həyatına son qoyub. Fabriklərdə, zavodlarda, neft istehsalı sahəsində işçi qüvvəsi çatışmır. Elə müasir dram əsərləri yazılmalıdır ki, o boşluğun doldurulmasında mühüm rol oynasın. Səməd Vurğun akademik, ictimai xadim, deputat kimi yuxarı dövlət dairələrinin kulisində gedən ideoloji layihələrin mahiyyətindən xəbərdardır. O nəzəriyyəçi alim kimi Məmməd Cəfərin fəhlə mövzusuna nəzəri baxışları ilə tanış olmaq istəyir. Yazılmış əsərlər haqqında yox, daha çox yazılacaq əsərlərin kəmiyyət və keyfiyyətinin yüksəldilməsi üçün nə etmək lazım gəldiyini soruşur. Elmi sesiyanın sədri incə məqamı düzgün

dəyərləndirir, verilən suallara məruzəçinin hazır olmadığını, mövzunun ciddiliyini duyaraq problemlə bağlı ayrıca sesiya keçirməyi məsləhət görür. Bu, mövcud situasiyada ən doğru qərar idi.

Azərbaycan Elmlər Akademiyasınında Nizami adına Ədəbiyyat İnstitutu ilə bağlı ən çox müzakirə olunan mövzu institutda hazırlanan altı-cildlik "Azərbaycan əddəbiyyatı tarixi" olmuşdur. Vitse-prezident Heydər Hüseynovun sədrliyi ilə İctimai Elmlər Bölməsinin 1949-cu il 14 iyun tarixli iclasının gündəliyinə də məhz bu mövzu gətirilmişdir. İnstitutun direktoru Məmməd Arif Dadaşzadə altıcildlik "Azərbaycan əddəbiyyatı tarixi"nin vəziyyəti haqqında bölmə üzvləri qarşısında geniş məruzə etmiş, cildlərin müəlliflərindən Həmid Araslı, Feyzulla Qasımzadə, Mir Cəlal iş prosesində üzləşdikləri problemlər barədə məlumatlar vermişdilər. Bölmənin iclasında iştirak edən akademik Səməd Vurğun söz alaraq demişdir: "Yoldaşlar, mən öz çıxışımı Dadaşzadə (Məmməd Arif nəzərdə tutulur. – A.R.) yoldaşın təklifindən başlamalıyam. Mənə belə gəlir ki, artıq bizim ədəbi elmimiz, ümumən ədəbi yaradıcılığımız belə bir mərhələyə gəlib çatmışdır ki, biz hamımız gözəl tarixçi olmaqla, ədəbiyyatşünaslığı marksizm-leninizm əsasında möhkəm qura bilərik. Nəinki bədii yaradıcılıq xalqın tarixi vətənidir, elm bunun yaradıcısıdır. Məhz buna görə də bizim ədəbiyyatşünaslarımız hələ də tarixi yaxşı bilmir. Ona görə də bu cür tarixi səhvlərə yol verirlər. Mənim birinci təklifim odur ki, bu işi akademiyanın və bunun elmlər şöbəsi (İctimai Elmlər Bölməsi nəzərdə tutulur. – A.R.) müstəqil olaraq aparmalıdır. Madam ki, ayrı-ayrı institutlara qaldıqda bir iş görmürlər. Bu işi aparmaq lazımdır. Məsələn, cavan kadrolardan İqrar Əliyev Midiya tarixindən çox yaxşı, cəsarətlə yazmışdır. Ancaq Həmid Araslı yoldaş əsl xalqın qəhrəmanlıq tarixinə çox az fikir vermişdir. Mən özüm "Vaqif" əsərini yazdığım zaman əgər tarixi yaxşı öyrənsə idim heç də bu qədər nöqsanlara yol verməzdim.

Yoldaşlar, mən bu gün Qasımzadə (Feyzulla Qasımzadə nəzərdə tutulur. - A.R.) yoldaşın çıxışından bir şey hiss etdim. Bu yenə qəzəl şairlərinə müəyyən bir yol vermək istəyir. Mənim fikrimə görə Azərbaycanda bir nəfər qəzəl-şeir yazan olmuşdur ki, o da Füzuli. Hansı qəzəl-şeirdən danışırsınızsa danışın bunun nə əhəmiyyəti var. Nə olsun çox qəzəl-şeir yazanlar olmuşdur? Bunların qəzəllərindən heç bir zaman mən zövq almamışam. Əgər bunlar yaxşı şair idisə nə üçün Azərbaycanın kəndi belə bunları tanımır. Əsas biz işimizi ədəbiyyat üzərində qurmalıyıq.

Mən bir məsələyə də toxunmaq istəyirəm. Altı tomluq (cildlik) əsəri çıxarmaq çox böyük məsələdir. Mən şəxsən ümidvaram ki, bu ciddi məsələlərin öhdəsindən burada oturan yoldaşlar gələ bilərlər və gəlməliyik də! Xüsusən partiya və hökumətimizin qərarlarından sonra bir sıra ciddi nöqsanlarımız meydana çıxarılmışdır, yoldaşların hamısı əsas məsələni başa düşmüşlər. Necə danışmaq lazımdır, bunların hamısı, özü bir daha şərait yaradır. Ancaq 6 tom əsərin yaradılması üçün mən heç də elmi tələsməyin tərəfdarı deyiləm. Məncə heç kəs demir ki, oktyabr ayında bu əsər hazır olsun. Əsəri hazır etmək lazımdır. Alim düşünməli və işləməli, hissə qapılıb tələsmək, elmi yazmaq düzgün deyildir.

Xüsusən belə bir böyük 6 tomluq əsəri yazmaq üçün qətiyyən tələsmək lazım deyildir. Əsl sürət işin keyfiyyətində olmalıdır.

Mənim yaxşı yadımdadır, 5-6 ay bundan qabaq açotlara (hesabatlara) qulaq asan zaman mən orada çıxış etdim. Yəqin ki, mənim həmin çıxışımın stenoqramması durur. Lazım olsa oxumaq da olar. Mən orada göstərdim, indiki inkişaf dövrümüzdə tərtib etdiyimiz planlar vardır, o planlar daha da kəskin qoyulmalıdır. Çox təəssüf ki, mənim orada danışdığım təkliflərin hamısı kağız üzərində qaldı. Heç də mənə sağ ol deyən olmadı. Əgər o təkliflər prezidiuma (rəyasət heyətinə) təqdim olunsa idi prezidium o təklifləri həyata keçirə bilərdi. Mən yenə deyirəm, gec deyildir, bu əsərlər üzərində danışırıq. Bir neçə canlı temalar (mövzular) seçməklə 49-cu il planına daxil edək. Bizim alimlərimizin yazdığı əsərlər Ümumittifaq miqyasında yüksəlsin və orada öz qiymətini alsın" (AMEA RH Arxivi, fond-7, siyahı-1, iş-631, səh.-139-141).

Akademik Səməd Vurğunun stenoqrafçı xətaları ilə kağıza köçürülmüş bu çıxışı çoxcildlik "Azərbaycan əddəbiyyatı tarixi"nin yaradılması uğrunda mücadilənin önündə getdiyini, milli məfkurəyə dayalı ideya istiqamətini müəyyənləşdirən görkəmli ədəbiyyatşünas olduğunu, əsl mənəvi dəyərlərə fövqəladə önəm verdiyini, elmi düşüncələrini böyük səmimiyyətlə, özünütənqid ruhunda ifadə etməyi bacardığını təsdiqləyir. Çoxcildli ədəbiyyat tarixinin ağırlığını, çətinliyini, məsuliyyətini dərk etməklə yanaşı gənc ədəbiyyatşünasların, ədəbiyyat tarixçilərinin "bu ciddi məsələlərin öhdəsindən" layiqincə gələcəklərinə onun böyük ümidlər bəsləməsi Azərbaycan ədəbiyyatının sabahına inamın, əminliyin sarsılmaz ifadəsidir.

Akademik Səməd Vurğunun elmi konfranslarda, sesiyalarda, tədbirlərdə, iclaslarda etdiyi məruzələr, çıxışlar, polemikalar, rəylər, fikir mübadiləsi onun ədəbi-ictimai düşüncəsini, dünyagörüşünü, fəlsəfi baxışını, milli ruhunu özündə əks etdirən yaradıcılıq aləminin tərkib hissəsidir. Akademikin arxivlərdən üzə çıxarılan hər bir yeni çıxışı, rəyi, düşüncəsi onun sözü mülkünün, yaradıcılıq xəzinəsinin zənginliyinə, tamlığına, bütövlüyünə xidmət etməklə yanaşı Azərbaycan ədəbiyyat-şünaslığının dəyərli nümunəsidir.

# YENİ NƏSİL "AZƏRBAYCAN DİLİ" PROQRAM VƏ DƏRSLİKLƏRİNDƏ SÖZÜN LEKSİK-SEMANTİK XÜSUSİYYƏTLƏRİ İLƏ BAĞLI İŞLƏRİN MƏZMUNCA QOYULUŞU

**Aynur QAFARLI,**
**Azərbaycan Dövlət Pedaqoji Universitetinin müəllimi**

***Açar sözlər:*** *söz, proqram, dərslik, leksik-semantik xüsusiyyət, məzmun, nitq, lüğət ehtiyatı.*
***Ключевые слова:*** *слово, программа, учебник, лексико-семантическая особенность, содержание, речь, словарный запас*
***Key words:*** *word, programme, text-book, lexical-semantical features, content, speech, vocabulary*

**Məsələnin qoyuluşu.** Ümumtəhsil məktəblərində "Azərbaycan dili" təliminin başlıca məqsədi şagirdlərin nitq mədəniyyətinin formalaşdırılmasıdır. Mədəni nitq isə sözə, onun məna xüsusiyyətlərinə bələdlikdən başlayır.

**İşin məqsədi** "Azərbaycan dili" fənn (proqramında) kurikulumunda və bu əsasda hazırlanmış yeni nəsil dərsliklərində sözün leksik-semantik xüsusiyyətlərinin mənimsədilməsi ilə bağlı bilik və bacarıqların hansı məzmun və formada qoyuluşunu təhlil etməkdir.

Dil təlimində sözün məna xüsusiyyətləri üzərində aparılan işlər həmişə maraq dairəsində olmuşdur. Təhlil göstərir ki, şagirdlərin linqvistik bilik və bacarıqlarının inkişafına istiqamətlənmiş və sistematik kurs şəklində tərtib olunmuş ənənəvi "Azərbaycan dili" proqramlarında söz üzərində iş, bir qayda olaraq, "Leksika" bəhsi ilə məhdudlaşdırılırdı. Belə bir yanaşma məzmunca daha geniş işlənilmiş 2002-ci il proqramında qabarıq əksini tapmışdır. Burada Azərbaycan dilinin lüğət tərkibi və onun zənginliyi, cümlənin qurulmasında və fikrin ifadə olunmasında sözün rolu; sözün lüğəvi (leksik) mənası, sözün həqiq və məcazi mənaları; təkmənalı və çoxmənalı sözlər, çoxmənalı sözlərdə əsas məna və məna çalarları; omonimlər, omonimlərin çoxmənalı sözlərə oxşar cəhətləri və onlardan fərqi, omonimlərin mənalarının mətndə, digər sözlərlə əlaqədə müəyyənləşdirilməsi; sinonimlər, sinonimlərin mənaları arasında incə semantik yaxınlığın olması; antonimlər, antonim sözlərin qarşılaşdırılması, antonimlər vasitəsilə bədii dildə təzad yaradılması kimi nəzəri-praktik mahiyyətli işlərə xüsusi yer verilmişdir [13, s. 15]. Həmçinin nəzərdə tutulur ki, bu biliklərə yiyələnən şagird:

- sözün leksik mənasını izah etməyi;
- sözün həqiqi və məcazi mənalarını fərqləndirməyi;
- verilmiş sözlərdə omonim, sinonim və antonimləri seçə bilməyi;
- ümumişlək sözlər və ümumişlək olmayan sözləri fərqləndirməyi;
- verilmiş sözləri leksik təhlil etməyi və s. bacarmalıdır [13, s. 16].

Qeyd olunan işlərin yalnız "Leksika" bəhsi ilə məhdudlaşdırılması təlim prose-

sində şagirdlərin sözün məna xüsusiyyətləri ilə bağlı müvafiq bacarıqlara yiyələnməsini ləngidən başlıca amildir. Bu məzmun eyni tələblər əsasında yazılmış dərsliklərə də sirayət etmişdir. Belə ki, sistematik kursu əks etdirən orta məktəb "Azərbaycan dili" dərsliklərində sözün məna xüsusiyyətləri ilə bağlı nəzəri və praktik işlər, adətən, 5-ci sinifdə "Leksika" bəhsinin məzmununda nəzərdə tutulub. Sonrakı siniflərdə isə yalnız təsadüfi hallarda leksik-semantik xarakterli tapşırıqlara rast gəlinir. Belə bir yanaşma ənənəvi proqram əsasında hazırlanmış sonuncu nəsil "Azərbaycan dili" dərsliklərində daha qabarıq şəkildə əks olunmuşdur. Burada "Söz və onun leksik mənası", "Sözün həqiqi və məcazi mənası", "Təkmənalı və çoxmənalı sözlər", "Omonimlər", "Sinonimlər", Antonimlər", "Ümumişlək sözlər və ümumişlək olmayan sözlər", "Əsl Azərbaycan sözləri və alınma sözlər", "Yeni sözlər (neologizmlər)", "Köhnəlmiş sözlər (arxaizmlər)", "Frazeoloji birləşmələr" başlığı altında getmiş paraqraflarda [1, s. 70-95] şagirdlərdə bir linqvistik vahid kimi söz haqqında müəyyən təsəvvür yaradılır. Bu məqsədlə verilmiş aşağıdakı məlumatları daha əhəmiyyətli hesab etmək olar:

- "Söz dilin əsas vahididir";
- "Sözlər əşyaları, hərəkəti, əlaməti, miqdarı ifadə etməyə xidmət göstərir. Hər bir sözün ifadə etdiyi mənaya onun leksik mənası deylir. Leksik məna odur ki, həmin sözü deyərkən nəyi başa düşürük. Sözlərin leksik mənası izahlı lüğətlərdə öz ifadəsini tapır" [1, s. 70].

Dərslikdə sözün leksik mənasının izahedilmə yolları ilə bağlı şagirdlərə müvafiq göstərişlər verilir. Göstərilir ki, sözün mənasını izah etmək olar:

a) həmin sözə yaxın mənalı söz seçməklə (təməl – bünövrə, qabil – bacarıqlı, hünərli);

b) əşyanın, hərəkətin əlamətlərini izah etməklə (sarıköynək – sarı rəngli quş, şütümək – sürətlə ötüb keçmək);

c) sözün hissələrinin mənasını açmaqla (ovlaq – ov yeri, meşəbəyi – meşə gözətçisi) [1, s. 70-71].

Daha sonra bu əsasda konkret tapşırıqlar vasitəsilə şagirdlərdə zəruri vərdişlər yaradılır. Digər paraqraflarda eyni qaydada davam etdirilən məlumat xarakterli bu biliklər uyğun çalışmalar üzərində aparılan tapşırıqlarla möhkəmləndirilir. Konkret sözlər, bəzən cümlə və kiçik mətn parçaları, hətta şəkillər üzərində yerinə yetirilməsi nəzərdə tutulan həmin tapşırıqlar sözün leksik-semantik məna xüsusiyyətlərinin aydınlaşdırılmasına xidmət edir. Bu tapşırıqlarda aşağıdakı fəaliyyət feil-lərindən istifadə edilməklə şagirdlərdə sözün mahiyyətini anlamaq, məna xüsusiyyətlərini müəyyənləşdirib nitqdə düzgün işlətmək vərdişlərinin formalaşdırılması planlaşdırılır: göstərin (məsələn,omonim sözləri), tapın, seçin, məna fərqini izah edin, əvəz edin, qruplaşdırın, əsaslandırın, söz birləşmələri və cümlələr düzəldin, mətn tərtib edin. Dərslikdə verilmiş çalışmaların əksəriyyəti ayrı-ayrı sözlər üzərində qurulduğundan şagirdlərin şifahi və yazılı nitq bacarıqlarının formalaşmasında əhəmiyyətli rol oynamır. Əksər hallarda nəzəri məlumatların möhkəmləndirilməsi məqsədi daşıyan bu tipli tapşırıqların yerinə yetirilməsi şagirdlərdə elə də böyük maraq oyatmır. Ən qüsurlu cəhət budur ki, sözün məna xüsusiyyətləri ilə bağlı müəyyən linqvistik təsəvvürə malik olan şagirdlər praktik şəkildə sözlə işləmək bacarığına yiyələnməkdə çətinlik çəkirlər. Bu da ondan irəli gəlir ki, onlara mətn daxilində

sözün hansı məna çaları kəsb etdiyi, hansı yaxınmənalı sözlə əvəz edilə bilməsi kimi bacarıqlar aşılanmır.

Növbəti siniflər üçün nəzərdə tutulmuş "Azərbaycan dili" dərsliklərində sözün morfoloji cəhətləri və sintaktik vəzifəsi ilə əlaqədar tapşırıqlara geniş yer verildiyi müşahidə olunsa da, nadir hallarda leksik-semantik xüsusiyyətləri üzərində iş aparılması müşahidə olunur. Bu tapşırıqlar sırasında aşağıdakı nümunələri xüsusi qeyd etmək istərdik:

28. İsimlərə aid aşağıdakı qaydada misallar söyləyin:

1. İnsan adlrı bildirən isimlər: ...
2. Qohumluq əlaqələrini bildirən isimlər: ...
3. Heyvan adlarını bildirən isimlər: ...
4. Bitki adlarını bildirən isimlər: ...
5. Nəqliyyat vasitələrinin adlarını bildirən isimlər: ...
6. Ev əşyalarının adlarını bildirən isimlər: ...
7. Silah adlarını bildirən isimlər: ...
8. Çalğı alətlərinin adlarını bildirən isimlər: ...
9. Təbiət hadisələrinin adlarını bildirən isimlər: ...
10. Mücərrəd varlıqların adlarını bildirən isimlər: ... [2, s. 13].

Nitq hissələri üzrə leksik-semantik söz qruplarının müəyyənləşməsində və qavranılmasında mühüm rol oynayan bu tipli çalışma növünə bir də "Sifət" bəhsində müraciət olunmuşdur:

"163. Verilmiş sözləri aşağıdakı məna növləri üzrə qruplaşdırıb yazın:

1. Rəng bidirənlər: ağ, ...
2. Dad bildirənlər: şirin, ...
3. Həcm bidirənlər: uzun, ...
4. Keyfiyyət bidirənlər: çalışqan, ...
5. Zahiri görkəm bildirənlər:, nurani, ... " [2, s. 161-62].

Həmin dərsliklərdə nitqin zənginləşməsində mühüm rol oynayan omonim, sinonim, antonim və coxmənalı sözlər üzərində işlərə isə, demək olar ki, rast gəlinmir. Təsadüfi hallarda müraciət olunan belə tapşırıq nümunələrində əsas məqsəd nitq inkişafı deyil, linqvistik biliklərin möhkəmləndirilməsidir. Məsələn, 6-cı sinif dərsliyi çalışma 162-də əlavə tapşırıq kimi verilir: "İkinci mətndə omonim kimi işlənilmiş sarı sözünün mənalarını izah edin. Onlardan hansı sifətdir?" [2, s. 61]. 8-9-cu sinif dərsliklərində isə, demək olar ki, sözün semantik-leksik xüsusiyyətləri ilə bağlı tapşırıqlara rast gəlinmir. Verilən bəzi izahlar isə sırf məlumat xarak-terlidir və yadda saxlamaq məqsədi daşıyır. Məsələn, çalışma 117-yə nəzər yetirək:

"Oxuyun, yadda saxlayın.

İbtida, ibtidai, mübtəda sözləri mənşəyinə görə ərəb dilindən alınma olub, bir kökdəndir. İbtida sözü başlanğıc, baş, əvvəl, başlama mənasında, ibtidai sözü başlanğıca aid, ən əvvəl olan mənasındadır. Mübtəda sözü də başlanğıc, baş mənasındadır. Bu söz həm də qrammatikada baş üzvlərdən birini – birincisini bildirir" [12, s. 49].

8-9-cu sinif dərsliklərində bəzi çətin sözlər səhifə kənarlarında fəqrli rənglə verilir. Bu cür təqdim edilmədə başlıca məqsəd onların düzgün yazılış və deyiliş qaydasını şagirdlərə mənimsətməkdir və dərslik müəllifləri, hər şeydən öncə, bu amildən çıxış etmişlər. Lakin qabaqcıl məktəb təcrübəsi göstərir ki, yeri düşdükcə bəzi sözlər leksik-semantik baxımdan təhlilə cəlb edilə bilir və beləliklə, onların mənaca dəqiq mənimsənilməsində ortaya çıxan çətinliklər aradan qaldırılır. Eyni zamanda bu fakt onu göstərir ki, çətin sözlər anlayışı adı

altında dərslik müəllifləri, ilk növbədə, yazılışı və deyilişi arasında fərq olan sözləri nəzərdə tutmuşlar.

Məlum məsələdir ki, mənası şagirdə aydın olmayan sözün yazılış və deyiliş qaydası şüurlu şəkildə mənimsənilməz. Bundan əlavə, təhlilə cəlb edilən dərsliklərdə lüğət üzrə işlərə, demək olar ki, müraciət olunmamışdır. Tapşırıqların böyük əksəriyyəti linqvistik mahiyyət daşıyır və şagirdlərdə müvafiq fonetik, leksik, qrammatik bacarıqların formalaşdırılmasına yönəlib.

Bu yanaşma müəyyən dərəcədə 5, 6 və 7-ci siniflər üçün hazırlanmış sonrakı nəsil "Azərbaycan dili" dərsliklərində də gözlənilmişdir [7; 8; 9]. Sözün leksik-semantik xüsusiyyətləri barədə şagirdlərə verilən biliklər əvvəlki illərdə hazırlanmış dərsliklərdən ciddi şəkildə fərqlənmirdi. "Yadda saxlayın" rubrikasında nəzərdə tutulmuş həmin məlumatlar "Söz və anlayış", "Sözün mənasını necə izah etməli?", "Sözün məcazi mənası necə yaranır?", "Çoxmənalılıq necə yaranır?", "Omonim nədir?", "Omonimlərin poeziyada rolu", Omonimlər və çoxmənalı sözlər", "Sinonimlər nədir?", "Sinonimlərin nitqdə rolu", "Antonim nədir?", "Antonimlərin bədii dildə rolu", "Sözlər niyə köhnəlir?", "Yeni sözlər necə yaranır?" və s. yarım-başlıqlar adı altında verilir [8, s. 72-101]. Sinfin anlam səviyyəsinə uyğun işlənilmiş bu məlumatlar praktik tapşırıqlar vasitəsilə sözü duymaq, onun mənası üzərində işləmək bacarıqlarının formalaşmasına xidmət edir. Dilimizin daxili quruluşunu əks etdirən sistematik kursun ən zəruri fakt, hadisə və qaydalarını mənimsətməyə istiqamətlənmiş həmin dərslikləri əvvəlkilərdən fərqləndirən başlıca xüsusiyyət "Sözlük" yarımbaşığı ilə bəzi çətin sözlərin izahının verilməsidir. Fikrimizcə, bu təqdimat forması, ilk növbədə, sözlə yaxından tanışlığa, onun məna xüsusiyyətlərinin dərindən mənimsənilməsinə böyük yardım göstərmiş olur. Həmin nümunələrdən bir neçəsini nəzərdən keçirək.

"Labirint – 1) dolanbac və dolaşıq yolları olan tikili, 2) əyləncəli oyun növü" [8, s. 10].

"İsmarış – xəbər, tapşırıq" [8, s. 82].

"Zümrüd – 1) Yaşıl rəngli qiymətli daş; 2) Əfsanəvi quş, Simurqun başqa adı" (7, s. 70).

"Qundaq – 1) körpə uşaqların sarğı ləvazimatı, 2) tüfəngin çiyinə söykənilən ağac hissəsi" " (7, s. 70) və s.

Bundan əlavə, həmin dərsliklərdə "Mətnlə iş" rubrikası altında getmiş çalışmalarda bəzi sözlərin sinonim və antonim qarşılığının müəyyənləşdirilməsi ilə bağlı tapşırıqlar da verilir. Lakin bu, sistemli şəkildə aparılmadığından şagirdlərdə sözlə, onun leksik-semantik xüsusiy-yətləri ilə bağlı lazımi bacarıqlarının formalaşdırılması işi səmərəli sayıla bilməz.

2012-2013-cü dərs ilindən ümumi orta təhsil səviyyəsinin 5-ci sinifləri yeni "Azərbaycan dili" fənn proqramı və bu əsasda hazırlanmış dərsliklər üzrə tədrisə başlamışlar. Ənənəvi proqram və dərsliklərdən fərqli olaraq, burada hər təhsil səviyyəsinin və hətta hər sinfin sonunda şa-girdlərdən hansı təlim nəticələri gözlənilməsi konkret şəkildə göstərilmişdir ki, bunların bir qismi məhz mədəni nitq vərdişlərinin inkişafı ilə bağlıdır. Dinləyib-anlama və danışma, oxu, yazı və hətta dil qaydaları məzmun xətlərinə aid standartların təhlili də göstərir ki, burada şagirdlərin lüğət ehtiyatının zənginləşdirilməsi təlim prosesinin mühüm tərkib hissəsi kimi daim diqqətdə saxlanılmışdır. Bunu aşağıdakı cədvəldə əyani şəkildə görmək mümkündür.

Sözün məna xüsusiyyətləri ilə bağlı 5-9-su siniflərin sonunda gözlənilən təlim nəticələri.

Cədvəl 1.

| V sinfin sonunda şagird: | VI sinfin sonunda şagird: | VII sinfin sonunda şagird: | VIII sinfin sonunda şagird: | IX sinfin sonunda şagird: |
|---|---|---|---|---|
| - lüğətdən istifadə etməklə tanış olmayan sözlərin mənasını müəyyənləşdirir | - mətndəki tanış olmayan sözlərin mənasını şərh edir; | - mətndəki tanış olmayan sözlərin kontekstə uyğun mənasını dəqiqləşdirir; | - mətndəki tanış olmayan söz və ifadələrin mənasını şərh edir; | - tanış olmayan söz və ifadələrin kontekstə uyğun mənasını şərh edir. |

Həmçinin "Oxu" məzmun xəttinə aid əsas "2.1. Mətndə tanış olma-yan sözləri mənimsədiyini nümayiş etdirir" standartı [14, s. 21, 23, 24, 27, 29] şagirdin sözün leksik-semantik xüsusiyyətlərinə bələd olması, sözlə işləmək və istənilən fikri düzgün və əhatəli etmək bacarıqlarının formalaşması məqsədinə xidmət edir. Həmin əsas standartın 5-9-cu siniflər üzrə şaqüli inteqrasiyada verilmiş alt standartları şagirdlərin sözlə əlaqədar hansı bacarıqlara yiyələnməsini konkret şəkildə ifadə edir.

"Azərbaycan dili" fənn proqramında (kurikulumunda) 5-9-cu siniflər üzrə sözün məna xüsusiyyətlərinin mənimsənilməsi ilə bağlı alt standartlar.

Cədvəl 2.

| V sinifdə şagird: | VI sinifdə şagird: | VII sinifdə şagird: | VIII sinifdə şagird: | IX sinifdə şagird:: |
|---|---|---|---|---|
| 1.1.1. Tanış olmadığı söz və ifadələrin mənasını müvafiq qarşılığını tapmaqla şərh edir; | 2.1.1. Lüğətdən istifadə etməklə tanış olmadığı sözlərin mənasını şərh edir; | 2.1.1. Tanış olmadığı sözlərin kontekstə uyğun mənasını dəqiqləşdirir; | 2.1.1. Tanış olmadığı söz və ifadələrin mənasını müvafiq qarşılığın tapmaqla şərh edir; | 2.1.1. Tanış olmayan söz və ifadələrin kontekstə uyğun mənasını şərh edir. |
| 2.1.2. Həqiqi və məcazi mənalı söz və ifadələrin mənasını şərh edir | 2.1.2. Sözləri həqiqi və məcazi mənada işlənməsinə görə fərqləndirir. | 2.1.2. Mətndəki sözlərin həqiqi və ya məcazi mənada işləndiyini izah edir. | 2.1.2. Həqiqi və məcazi mənalı söz və ifadələrin mənasını nümunələrlə şərh edir. | 2.1.2. Həqiqi və məcazi mənalı söz və ifadələrin mənasını kontekstə uyğun dəqiqləşdirməklə şərh edir. |

Alt standartların məzmunundan göründüyü kimi, şagird sözün mənasını ya lüğətdən istifadə yolu ilə, ya da işləndiyi kontekstə uyğun izah edə, dəqiqləşdirə və ya şərh edə bilər. Həmçinin tələb olunan əsas cəhətlərdən biri şagirddə sözün həqiqi və məcazi mənasını fərqləndirmə, nitqində düzgün işlədə bilmə bacarıqlarının formalaşdırılmasıdır. Yeni fənn proqramında (kurikulumunda) diqqəti çəkən məqamlardan biri 5-ci sinifdə "Dil qaydaları" məzmun xəttinin 4.1.2. alt standartında şagirddə sözün səs tərkibi, yaranma üsulları və qrammatik mənası ilə yanaşı, semantik xüsusiyyətlərini izah edə bilmə bacarığının yaradılmasıdır [14, s.21]. Lakin sözün semantik xüsusiyyətləri ilə bağlı "Dil qaydaları" məzmun xəttində getmiş həmin fəaliyyət növü yuxarı siniflərdə artıq tələb olunmur ki, bu da yeni proqramda nəzərdən qaçırılmış fakt kimi göstərilə bilər. Qeyd edilən bu irada baxmayaraq, yeni proqramın ənənəvi proqramlardan üstünlüyü açıq-aşkar duyulur. Belə ki, burada təlim prosesində hansı fəaliyyətlər, hansı bacarıqlara şagirdin yiyələnməli olması dəqiq qoyulmuşdur. Ən ümdəsi, bu bacarıqlar linqvistik biliklərin aşılanmasına deyil, sırf mədəni nitq vərdişlərinin yaradılması və inkişafına xidmət edir. Alt standartlarda ifadə olunmuş fəaliyyət təlim nəticələrinin konkretliyinə şərait yaradır və bununla da dərslik müəlliflərini düzgün istiqamətləndirir. Bunu yeni nəsil "Azərbaycan dili" dərsliklərinin müvafiq problem üzrə təhlilində də müşahidə etmək mümkündür.

V sinif dərsliyində 6 bölmədə ("Ailə və məktəb", "Niyə belə deyirik", "Mənəvi dəyərlər", "Tarixi-mədəni abidələr", "Ana təbiət", "Tarixdə iz qoyanlar") getmiş mövzular və onlara aid tapşırıqların təhlili göstərir ki, burada başlıca məqsəd şagirdlərin nitq bacarıqlarını inkişaf etdirməkdir. Nitqin dinləyib-anlama, danışma, oxu və yazı kimi fəaliyyət növləri üzrə yerləşdirilmiş və "Dil qaydaları" məzmun xətti ilə inteqrasiya edilmiş bu tapşırıqlarda sözün məna xüsusiyyətlərinə bələdlik mühüm yer tutur. Belə bir yanaşma 6-7-ci sinif dərsliklərində də gözlənilmişdir. Xüsusilə mətndaxili və mətndən sonra verilmiş tapşırıqlarda şagirdlərin sözün mənasını anlamaq, sinonim və antonim qarşılığını göstərməklə izah etmək, kontekstdə işlənmə yerinə görə əvəz etmək, oxşar və fərqli mənalı sözləri qruplaşdırmaq bacarıqları inkişaf etdirilir və müvafiq sözlərdən istifadə yolu ilə mətn tərtib etmək bacarıqları formalaşdırılır. Müəyyən metodik sistemdə işlənilmiş bu tapşırıqlar şagirdlərdə sözə həssas yanaşmaq, onun məna xüsusiyyətləri üzərində müstəqil işləmək kimi vərdişlər yaradır. V-VII sinif dərsliklərində "Söz ehtiyatı" [5; 6; 10], VIII-IX sinif dərsliklərində isə "Nitqi zənginləşdirmə" və "Lüğət", "Açar sözlər" rubrikaları altında verilmiş söz və ifadələr, tapşırıqlar [3; 4] sadalanan vərdişlərin formalaşmasını sürətləndirir. 5-7-ci sinif dərsliklərinin sonunda həm də "Sözlük" başlığı altında çətin sözlərin izahı verilmişdir [5, s. 192-199; 6, s. 184-191; 10, s. 168-175]. Növbəti sinif dərsliklərində sözlük nəzərdə tutulmasa da, mətn nümunələrindəki tanış olmayan yeni sözlər əsasında şagirdlərdən lüğət-yaratma layihə işi tələb olunur [3, s. 9]. İlboyu davam etdirilməsi planlaşdırılan belə bir layihə şagirdlərdə sözlə işləmək,

onun mənasını müstəqil izah etmək bacarıqları yaradır. İstər struktur, istərsə də məzmun baxımından özündən əvvəlki ənənəvi dərsliklərdən köklü şəkildə fərqlənən yeni nəsil dərsliklərinin üstünlüyü ondadır ki, onlar elmi-publisistik və bədii mətnlər vasitəsilə şagirdin həm ümumi dünyagörüşünün yüksəlməsinə, həm tənqidi və yaradıcı təfəkkürünün inkişafına, həm də mədəni nitq vərdişlərinin formalaşmasına yardım göstərir. Aydın olsun deyə bir neçə nümunəni nəzərdən keçirək.

5-ci sinif dərsliyində "Bizim riyaziyyat müəllimimiz" mövzusunun mənimsədilməsi məqsədilə "Söz ehtiyatı" yarımbaşlığında verilmiş tapşırıqlar mətndəki "yola vermək", "boğazında qalmaq", "gülüş obyekti" ifadələrinin müstəqil araşdırma və müşahidə üsulu ilə şüurlu qavranılmasına xidmət edir [5, s. 21].

Başqa bir nümunə. "Rəvayətli ifadələr" mövzusuna aid tapşırıqda tələb olunur: "Çəkmək və salmaq sözlərinin mənalarını izah edin. Sonra isə altından xətt çəkilmiş ifadələrə diqqət yetirin. Sözün mənası ilə ifadənin mənası arasında bağlılıq varmı?" [5, s. 21].

Göründüyü kimi, tapşırıqda qoyulmuş belə bir şərt artıq sözün kontekstdə ifadə etdiyi mənanı müqayisə yolu ilə mənimsəməyə yönəlib.

Yaxud, 8-ci sinif dərsliyindəki "Qori Seminariyasında Azərbaycan şöbəsi necə açıldı" mətni ilə bağlı çalışmalara diqqət yetirək:

Çalışma 5-də mətndə kursivlə fərqləndirilmiş mütərcim, seminariya, canişin, nəzdində sözlərinin leksik mənasının izah edilməsi, çalışma 6-da seminariya, lisey, gimnaziya sözlərinin məna fərqini göstərmək tələb olunur. Çalışma 7-də mətnin dördüncü cümləsindəki çoxmənalı sözlərin tapılması və bu fikrin müvafiq cümlələr qurulmaqla əsaslandırılması tapşırılır. Çalışma 8-də isə "dil" sözünün həm omonim, həm də çoxmənalı olduğunun sübut edilməsi bir şərt kimi qoyulur [3, s. 11].

Bu tipli işlər göstərilən dərsliklər üçün xarakterikdir və sistemli şəkildə davam etdirilir. Ən önəmlisi budur ki, tapşırıqların şərti şagirdləri düşünməyə vadar edir və onlarda tədqiqatçılıq bacarıqları yaratmağa yönəlib. Sözün leksik-semantik xüsusiyyətlərini müşahidə etmək, müqayisələr aparmaq, alınmış nəticələri ümumiləşdirmək və tətbiq etməklə bağlı bu kimi tələblər təlim prosesində idraki fəallıq yaradır və şagirdin lüğət ehtiyatını, deməli, həm də nitqini zənginləşdirir. Həmin dərsliklərdə söz üzərində işlə əlaqədar tapşırıqlara qoyulmuş şərtlər də olduqca rəngarəngdir. Burada şagirdlərdən tələb olunur:

1) Sözün kontekstə uyğun mənasını izah edin;

2) Mətndəki fərqli sözü seçin;

3) Mənasını müəyyənləşdirin;

4) Fərqləndirilmiş sözün (altndan xətt çəkilmiş, kursiv və ya başqa rənglə yazılmış) mənasını müəyyənləşdirin;

5) Lüğətdən istifadə etməklə söz və ifadələrin mənasını müəyyənləşdirin;

6) Verilmiş sözün mənalarını araşdırın;

7) Sözlərin mənasını müqayisə edin, oxşar və fərqli xüsusiyyətləri göstərin;

8) Verilmiş sözün omonim və ya çoxmənalı olduğunu müəyyənləşdirin;

9) Sinonim cütlüklərdən mətnin mənasına uyğun gələni dəqiqləşdirin;

10) Müvafiq sözlərdən istifadə etməklə kiçik mətnlər tərtib edin və s.

Yeni nəsil dərsliklərini ənənəvi dərsliklərdən fərqləndirən başlıca cəhət təkcə mətndaxili və mətnsonrası tapşırıqların şagirdi müstəqil fəaliyyətə yönəltməsi ilə deyil, həm də üzərində leksik-semantik iş aparılan sözlərin zənginliyi ilə bağlıdır. Təhlil göstərir ki, bu sözlərin əksəriyyəti şagirdlərin fəal lüğət ehtiyatına daxil olmayan sözlərdir. Lakin şagirdlərin dünyagörüşünün hərtərəfli formalaşması həmin sözlərin və onların ifadə etdikləri anlayışların dərkindən başlayır.

Yeni nəsil dərsliklərinin digər üstün cəhəti budur ki, burada sözlərin semantikası daha çox: 1) sözün həqiqi və məcazi mənasının qarşılaşdırılması; 2) sinonim qarşılığının müəyyənləşdirilməsi yolu ilə açıqlanır. Sistemli və davamlı səciyyə daşıyan bu işə 5-9-cu sinif dərsliklərinin hamısında geniş yer verilmişdir. Əgər ənənəvi dərsliklərdə sözün leksik-semantik xüsusiyyətləri V sinifdə tədrisi nəzərdə tutulmuş "Leksika" bölməsinin məzmunu ilə məhdudlaşırdısa, yeni dərsliklərdə xüsusi bir xətt kimi gözlənilmişdir. Əksər hallarda isim, sifət, feil və zərfə aid olan bu sözlərin məna açımı fkir mübadiləsi, müzakirələr, lüğətlər üzərində iş vasitəsilə həyata keçirilir.

Bütün bunlar onu göstərir ki, yeni nəsil dərslikləri linqvistik bilik və bacarıqlardan öncə, mədəni nitq vərdişlərinin formalaşması məqsədinə xidmət edir. Burada verilmiş sadə və ən zəruri dil qaydaları həmin məqsədə birbaşa yardım göstərən vasitə rolunda çıxış edir. Göstərilən cəhət yeni nəsil dərsliklərini ənənəvi dərsliklərdən daha maraqlı, daha praktik edir ki, bu da onların şagirdyönümlü, nəticəyönümlü olması ilə bağlıdır.

Bu müsbət xüsusiyyətlərinə baxmayaraq, yeni dərliklərdə metodik baxımdan bəzi qüsurlara yol verildiyi açıq şəkildə müşahidə olunur. Bunlar aşağıdakılardır:

1. Dərslikdəki mətnlər nisbətən irihəcmlidir və bu da dərs zamanı onlar üzərində qoyulmuş tapşırıqlara uyğun iş aparılmasına imkan yaratmır. Səhifə yarım, hətta bəzən 2-3 səhifə həcmində işlənilmiş bu mətnlərdəki tanış olmayan sözlərin izahı, leksik-semantik xüsusiyyətlərinin müəyyənləşdirilməsi şagirdlər üçün müəyyən çətinliklər yaradır.

2. Nəzərə çarpdırılan, mənası açıqlanan sözlərin şagirdlərin lüğətində, nitqində möhkəmləndirilməsi, təkrarlanması, dərinləşdirilməsinə az diqqət yetirilir. Belə ki, dərslikdə bir mətndə verilmiş yeni sözlərin başqa bölmələrə aid mətnlərdə digər məna xüsusiyyətlərinin açqlanmasına nadir hallarda müraciət olunur. Metodik araşdırmalar çoxdan sübut edib ki, mənası şagirdə aydın olmayan sözlər dərslik boyu müxtəlif tapşırıqlar vasitəsilə dəfələrlə nəzərdən keçirilməlidir. Yalnız belə olduqda o, şagirdin fəal lüğət ehtiyatnda öz yerini tuta bilər.

Göstərilən iradlara baxmayaraq, bu bir həqiqətdir ki, yeni nəsil dərsliklərində sözün leksik, semantik xüsusiyyətlərinin mənimsədilməsi ilə bağlı işlər daha praktik səciyyə daşıyır. Bu da dil təlimini nitqin fəaliyyət növləri üzrə qurmağa imkan yaradan başlıca amillərdəndir.

**Nəzəri və praktik əhəmiyyəti.** Şagirdlərin lüğət ehtiyatının və mədəni nitq vərdişlərinin formalaşması məqsədilə mövcud proqram və dərsliklərdə nəzərdə tutulan işlərin təhlilə cəlb edilməsi müvafiq ümumiləşdirmələr aparılmasına, nəzərdən qaçırılmış məqamlara aydınlıq gətirilməsinə imkanlar açır. Eyni zamanda, fənn müəllimlərinin tədrisdə

hansı iş növlərinə xüsusi diqqət yetirmələri müəyyənləşdirilir.

### *ƏDƏBİYYAT*


1. *Əfəndizadə Ə., Xudiyev N., Abbasov Ə., Əsgərov H., Azərbaycan dili (5-ci sinif üçün dərslik), Bakı: Təhsil, 2003.*
2. *Əhmədov B., Axundov A, Xəlilov B. Azərbaycan dili (6-7-ci siniflər üçün dərslik). Bakı: Təhsil, 2003.*
3. *Hacıyev T., Bektaşi S., M., Hüseynova Y., Azərbaycan dili (Ümumtəhsil məktəblərinin 8-ci sinfi üçün dərslik). Bakı: Şərq-Qərb Nəşriyyat evi, 2015.*
4. *Hacıyev T., Bektaşi S., Vəliyeva M., Hüseynova Y., Azərbaycan dili. (Ümumtəhsil məktəblərinin 9-cu sinfi üçün dərslik). Bakı: Şərq-Qərb Nəşriyyat evi, 2016.*
5. *İsmayılov R., Cəfərova D., Xudiyeva G., Qasımova X., Azərbaycan dili (5-ci sinif üçün dərslik). Bakı: Altun Kitab, 2012.*
6. *İsmayılov R., Cəfərova D., Məmmədova S., Azərbaycan dili (6-cı sinif üçün dərslik). Bakı: Altun Kitab, 2013.*
7. *İsmayılov R., Eyvazov F., Azərbaycan dili (6-cı sinif üçün dərslik). Bakı: Altun Kitab, 2008.*
8. *İsmayılov R., Qasımova X., Şahbazlı F., Əmircanova Q., Azərbaycan dili (5-ci sinif üçün dərslik). Bakı: Altun Kitab, 2008.*
9. *İsmayılov R., Qasımova X., Eyvazov F., Azərbaycan dili (7-ci sinif üçün dərslik). Bakı: Altun Kitab, 2006.*
10. *İsmayılov R., Rüstəmova A., Allahverdi H., Məmmədova S., Azərbaycan dili (7-ci sinif üçün dərslik). Bakı: Altun Kitab, 2014.*
11. *Kazımov Q., Azərbaycan dli (9-cu sinif üçün dərslik). Bakı: Aspoliqraf, 2008.*
12. *Kazımov Q., Şahbazlı F., Mikayılova A., (Ümumtəhsil məktəblərinin 8-ci sinfi üçün dərslik), Bakı: Aspoliqraf, 2010.*
13. *Ümumtəhsil məktəblərinin V-XI sinifləri üçün Azərbaycan dili proqramı. Bakı, 2002.*
14. *Ümumi təhsilin fənn standartları (I-XI siniflər). Bakı: Mütərcim, 2012.*


### *РЕЗЮМЕ*


*Постановка в программах и учебниках нового поколения*

*по «Азербайджанскому языку» работ по содержанию, связанных с лексико-семантическими особенностями слова*

*В процессе обучения продуктивная организация данной работы зависит от содержания работ, предусмотренных программами и учебниками соответствующего предмета, сферы деятельности. Результаты исследований показали, что в действующей программе (куррикулуме) по «Азербай-джанскому языку» и в подобных учебниках нового поколения, работы, проведённые над словом, являясь более охватными, носят системный и систематический характер. В статье нашли отражение вопросы, связанные с разрешением поставленной проблемы.*


### *SUMMARY*


*New generation "The Azerbaijan language" in the programmes and*

*text-books statement of the workby themically connected with*

*lexical-semantical features of the word*

*Word is the main language part and the identifying its lexical-semantical features serves the richness of the pupil's vocabulary and the improvement of ability of cultural speech. In the teaching process to organize this work usefully contains from the theme of the programmes and textbook which possess to the subject.*

*Investigations show that now "the Azerbaijan language" in the subject programmes (curriculum) and in the new generation textbooks and the work carried out on the word is more comprehensive and carries a systematical characher. In this article the issue of the statement of the problem reflected.*

# "KİTABİ-DƏDƏ QORQUD" VƏ DİLİMİZ

**Sədaqət HƏSƏNOVA,**
**filologiya elmləri doktoru, professor,**
**Naxçıvan Muxtar Respublikasının əməkdar müəllimi**

Hər bir xalqın mənəviyyatını, adət-ənənələrini, keçmişini, həyat tərzini, özəlliklərini təcəssüm etdirən göstəriciləri vardır. Bu baxımdan, xalqımız daha zəngin, daha çoxcəhətli qədim qaynaqlara malikdir. Bu mənbələr içində "Kitabi-Dədə Qorqud"un öz yeri, öz sanbal və çəkisi vardır. "Ana kitabımız" kimi dəyərləndirilən bu dastanlar düşüncə tariximizin, təfəkkür və nitq mədəniyyətimizin azman örnəklərindəndir. Türk dillərinə xas olan şairanə dildə düzülüb-qoşulmuş bu nadir sənət inciləri möhtəşəmliyi, müasirlik və ululuq keyfiyyətləri, dilinin zənginlik, təsiredicilik və semantik dərinliyi ilə seçilir. "Səsindən, sözündən başlamış cümlə təşkilinə qədər bu dil harmoniya nümunəsidir"(2, 5).

Sazın-sözün uca taxtına sahib olan "Kitabi-Dədə Qorqud" ilk növbədə dilinin şirinlik və gözəlliyi ilə diqqəti çəkir. Universitet görməyən, bəlkə də barmaqları qələm tanımayan dədələrimizin dövlət qurmaq, birlik siyasəti, el-oba məhəbbəti, kiçiklərə nəsihəti, böyüklərə hörməti, anaya, qadına münasibəti, ailə qayğısı, övlad sevgisi və s. elə inandırıcı və təsirli dillə ifadə olunmuşdur ki, onların yaşamı dövründə – neçə-neçə uzaq yüzilliklər bundan əvvəl dilimizin bu qədər mükəmməlliyinə heyran qalmamaq mümkün deyil.

Dədə Qorqudun sözü elin sözüdür. Bu söz haqqı Tanrıdan gəlir. Tanrı bu haqla insanı digər canlılardan seçərək ona yüksək məqam vermişdir. "Qədim dünyanın şahidləri sırasında söz birincidir" (4, 14). Dədəmiz Qorqud uzaq milyonilliklərdən, minilliklərdən gələn sözləri bir-birinə calamış, düzmüş-qoşmuş, söyləmləri, soyları ilə xalqı başına toplamış, sazla-sözlə nizamlamış, sazla-sözlə igidlərə ad vermiş, sazla-sözlə tərbiyə etmiş, məsləhət vermiş, sazla-sözlə alqışlayıb qarğışlamışdı. Və sözü elə məqamına salmış, elə yüksəyə qaldırmışdı ki, özündən sonra bu zirvəyə başqa bir dədənin adı yazılmamışdı.

Dədənin sözləri canlı idi, qanadlı idi, hiss ilə, həyəcan ilə, arzu-diləklərdən doğan ülviyyət, nəsihətlərdə yaşayan isti münasibət, el-obaya düzgün yol göstərmək istəyindən yaranan riqqət ilə dolu idi. Bu, türk dillərinə xas olan keyfiyyət göstəricilərindəndir. Türklərdə hissiyyatın güclü olması, sözsüz ki, onların dilindən ayrı deyildir. Hələ rəsmi yazı örnəyi hesab edilən "Orxon-Yenisey" abidələrinin dili bədii sözün qüdrətini təsdiq edir, rəsmi məsələlərin bədiiliklə ifadəsi tarixinin qədimliyini özündə yaşadan abidə kimi möhtəşəmliyini qoruyur. Bu baxımdan yanaşanda, bədii əsərdə sözün poetik dərinliyi təəccüb doğurmamalıdır. Lakin bu poetikliyin özəllikləri, seçkinlikləri "Kitabi-Dədə Qorqud" dastanında diqqəti daha çox çəkir. Xalqımızın söz yaddaşı olan bu böyük abidənin dili məziyyətlərinə görə əvəzsizdir. Sözün anlam baxımından dəyişməsi, çoxçalarlılıq qazanaraq yetkinləşməsi, dildə asan və yüngül deyilsə də, sanbalına görə get-gedə ağırlaşması dastanların dilində maraqlı və heyranedici bir mənzərənin yaranmasına səbəb olur.

"Kitabi-Dədə Qorqud"un diqqəti çəkən faktlardan biri atalar sözləri

səviyyəsində olan ifadələrin hikmət dərinliyidir. Dastanların məzmununda folklorun bu maraqlı janrına aid olan örnəklər geniş mövqeyə malikdir. "Müqəddimə"də Dədə Qorqudun dilindəki hikmətli ifadələrdən başqa, ayrı-ayrı boylarda da bir-birindən mənalı atalar sözləri işlənmişdir. Onsuz da Dədənin dili hikmət xəzinəsidir. Bu hikmət nəsihətli fikirlərdə daha da qabarıqdır:

*Ulaşuban sular daşsa, dəniz olmaz.*
*Təkəbbürlik eyləyəni Tanrı sevməz.*
*Könlin yuca tutan ərdə dövlət olmaz.*
*Yad oğulı saxlamaqla oğul olmaz (3, 19).*
*Ər malına qiymayınca adı çıqmaz.*
*Qız anadan görməyincə ögüt almaz.*
*Oğul atadan görməyincə süfrə çəkməz (3, 20).*

"Kitabi-Dədə Qorqud"un dili sözün yaradıcı, yaşadıcı qüdrətini əks etdirməyə qabil olan sərvətimizdir. "Təsadüfi deyildir ki, kainatın başlanğıcı üzərində baş sındıran qədim müdriklərin fikrincə, yaşayışın ilkin bünövrəsi, təməl daşı sözdür, onun təlqin gücüdür" (1, 4). Bu fikrin təsdiqi üçün dastanın leksikası və hətta dilin başqa laylarına aid olan faktları yetərincə material verib göstərə bilir ki, bu möhtəşəm ədəbi nümunənin dili dilimizin ilkin dövrünə aid fakt deyil, inkişaf və dolğunlaşma prosesi də deyil, çoxdan bəri işlənən dilimizin hansısa tarixi mərhələsinə aid örnəyidir. Yəni dastanların düzülüb qoşulduğu zaman elə bir tarixi dövrdür ki, söz artıq çoxdan yaranıb, deyilib, deyildikcə cilaanıb və yeni mənaları açıla-açıla işlənir, bu mənalar arasındakı bağlılıqlar üzə çıxır. Sözün qüdrətini heç nə ilə müqayisə etmək mümkün deyil. Artıq xeyli zamandır, belə bir həqiqət aksioma çevrilib ki, ən ağır xəstənin dərdinə əlac edə biləcək dərman da söz qədər təsirli ola bilməz. Deməli, söz insanın ən zəruri həyat ehtiyacıdır.

"Kitabi-Dədə Qorqud"un dilindəki sözlərin estetik təsiri axıcılığın, melodiyanın bolluğundan, zənginliyindən qaynaqlanır. Bunu reallaşdıran faktlardan biri əsərin dilindəki ritmik təkrarlardır. Bu təkrarlar dastanların dilinin sadəliyini, qulağa və ürəyə yatmasını, asanlıqla yaddaşlarda qalmasını əsaslandırır. Onlar lirik-bədii ovqat yaradır. Burada elə örnəklər var ki, onlar bədiiliyin yüksək həddinə, lirik nəsr səviyyəsinə qalxaraq həzin bir nəğmə təsiri bağışlayır. Tərkibində melodiklik yaradan ya təkrar, ya tərkibindəki iki sözdən biri ayrılıqda işlənməyən mürəkkəb sözlər, ya da sinonim sözlərdən ibarət olan birləşmə və cümlələr saya gəlməz. "Salqum-salqum dan yelləri", "quru-quru çaylar", "qatar-qatar qızıl dəvələr", "tavla-tavla şahbaz atlar", "şahbaz-şahbaz atlar", "qızıl-qızıl dəvələr", "alan-alçaq hava yerdən gələn arğış", "sağmısan-əsənmisən, canım Bamsı!", "açuq-açuq meydana bənzər", "qunt-qunt biləklər", "apul-apul yürüşün", "daşqın-daşqın sular", "oğul, oğul" deyübəni bozlayayınmı?", "qanlu-qanlu sular" və s. kimi dil faktları dastanın dilini ritmikləşdirir.

Ana dilimizin sehrini açan, sirlərini anladan "Kitabi-Dədə Qorqud"un dili bir xalqın, dövlətin, millətin tarixdə nələr yaşadığını, bu yaşam haqqını mərdliklə, namusla qazandığını göstərir. Dədəmiz Qorqud duyumları, düşüncələri – bütün mənəviləri sözlə maddiləşdirərək böyük bir xalqın tarixi mənəviyyatına işıq salır. "Əlində qopuz tutan Qorqud Atanın vətəni ana dili idi" (4, 13).

Qam Börənin oğlı Bamsı Beyrək boyını bəyan edər, xanım, hey" boyunda Beyrəyin bacısının nitqindən bir parçada sual cümlələrinə nəzər salaq:

*Mərə ozan! Qarşu yatan qara dağdan*
*Aşub gəldigində*
*Beyrək adlı bir yigidə bulışmadınmı?*
*Daşqun-daşqun suları*

*Aşub gəldigində-keçdigində*
*Beyrək adlı bir yigidə bulışdınmı?*
*Ağır-adlu şəhərlərdən gəldigində*
*Beyrək adlı bir yigidə bulışmadınmı?*
*Mərə ozan, gördünsə, degil mana!*
*Qara başım qurban olsun, ozan, sana! (3, 68).*

Dastanın nəzm hissəsinə aid olan bu misralarda cavab almaq məqsədindən çox, dərdlinin dərdini anlatması, intizar və həsrəti daha qabarıqdır.

Bədii dildə struktur baxımdan sual cümlələri o qədər fərqlənməsələr də, məna baxımından onların bir-birindən seçkinliyi təbiidir. Belə ki, obrazlılıq hər bir xalqın özünə məxsusdur, milli bədii təfəkkürünün məhsuludur. Bu anlamda, müxtəlif dillərdəki sual cümlələri ümumi məqsəd daşısa da, onların ifadəsi, hansı məqamda işlənməsi, hər hansı bir vəziyyəti anlatması və s. özəllikləri ilə seçilir.

Azərbaycan dilində sual cümlələrinin üslubların çoxunda işlənməsi faktları çoxdur. Sual cümlələri bədii, elmi, məişət, publisistik üslublarda işlənsə də, onların hamısında eyni dərəcədə fəallığa malik olmur. Belə cümlələr rəsmi-işgüzar üslub üçün, ümumiyyətlə, xarakterik deyil. Bədii üslubda həm qrammatik (cavab tələb edən), həm də ritorik (bədii; cavaba ehtiyacı olmayan) sual cümlələrindən istifadə edilir. Bu baxımdan, "Kitabi-Dədə Qorqud" dastanının dil və üslub keyfiyyətləri diqqəti çəkir:

*Qanı dedigim bəg ərənlər?*
*Dünya mənim deyənlər?*
*Əcəl aldı, yer gizlədi,*
*Fani dünya kimə qaldı? (3, 51).*

Dədə Qorqudun nitqindəki sual cümləsi ilə ifadə olunan misralarda bədiilik digər misralarla müqayisədə daha güclü və təsirlidir. Burada dərin fəlsəfi fikirlər, təəssüf, ən çox da nigarançılıq öz bədii əksini tapmışdır. Sözsüz ki, heç kəs bu suallara cavab verməyəcək və dədəmiz Qorqud konkret bir şəxs və ya obyektə cavab almaq məqsədi ilə müraciət etmir. O yalnız öz düşüncələrini, yurddaşlarına bir çox həqiqətləri anlatmaq istəyini tərənnüm edir. Və belə məqamlarda sual cümlələri daha dərin üslub xüsusiyyətləri qazanır ki, ifadəli nitqin meydana çıxmasında bunun böyük əhəmiyyəti vardır:

*Qadın ana! Qarşum alub nə bögrərsən?*
*Nə bozlarsan, nə ağlarsan?*
*Bağrımla yürəgim nə dağlarsan?*
*Keçmiş mənim günimi nə andırarsan?*
*Hey, ana! Ərəbi atlar olan yerdə*
*Bir qulunu olmazmı olur?*
*Qızıl dəvələr olan yerdə*
*Bir köşəgi olmazmı olur?*
*Ağca qoyunlar olan yerdə*
*Bir quzicuğu olmazmı olur?*
*Sən sağ ol, qadın ana, babam sağ olsun,*
*Bir mənim kibi oğul, bulunmazmı olur? (3, 46).*

Uruzun nitqindən alınmış bu nəzm parçasında adi bir sual ədatı dilin üslub keyfiyyətini çoxaldır. Buradakı sual cümlələrini nəqli cümlələrə çevirsək, yəni sual əlamətini (-mı4 sual ədatını) atsaq, dilin estetik gözəlliyi mətndəki kimi mükəmməl ola bilməz. İki hərfdən ibarət olan sual ədatı dildə bu qədər iş görürsə, dilimizdəki birləşmə və cümlələrin, sintaktik konstruksiyaların nələrə qadir olduğu danılmazdır. Deməli, dildə nəinki sözlərin, hətta adi işarələrin də böyük əhəmiyyəti vardır.

Dildə qarşılaşdığımız üslub özəlliklərindən biri də budur ki, əsas, yəni güclü məntiqi vurğu xəbərin öz üzərinə düşür. Belə məqamlarda qrammatika ilə üslubiyyat arasındakı fərqlər üzə çıxır. Qrammatik qaydalara görə, yazılı nitqdə vurğu xəbərdən əvvəlki sözün üstünə düşməlidir. Dastanın dilində isə vurğunun xəbərin öz üzərinə düşdüyü faktlar çoxdur. Belə

məqamlar həmişə olmur. Bu yalnız o zaman baş verir ki, xəbər sual ədatı ilə işlənir. Yuxarıdakı örnəyin "olmazmı olur?" sözləri ilə ifadə olunmuş xəbərləri bu baxımdan maraqlıdır.

Dastanın dilindəki maraqlı faktlardan biri də, bir sıra cümlələrdə xəbərlik şəkilçisinin aktiv mövqedə olmamasıdır. Xəbərlik əlamətləri fikrin bitməyinə, informasiyanın düzgün çatdırılmasına kömək etsə də, dilin fikir çalarını dəqiqləşdirsə də, əslində, vurğu qəbul etmir. Və buna görə də bu əlamətlərin işlənmədiyi sintaktik vahidlərdə vurğu, məna və lirizm bir qədər güclü olur ki, bu da nitqin intonasiya və təsirliliyinə müsbət təsir edir. Yenə də Beyrəyin bacısının nitqindən bir hissəyə baxaq:

*Qarşu yatan qara dağım yıqılubdur,*
*Ozan, sənin xəbərin yoq.*
*Kölgəlicə qaba ağacım kəsilibdir,*
*Ozan, sənin xəbərin yoq.*
*Dünyəlikdə bir qardaşım alınubdur,*
*Ozan, sənin xəbərin yoq.*
*Çalma, ozan, ayıtma, ozan,*
*Qaraluca mən qızın nəsinə gərək, ozan? (3, 69).*

Dastanın dilində "yoq" xəbərinin – dır4 xəbərlik şəkilçisi ilə işlənməməsi əsərin bədii gücünü artıran elementlərdəndir. Və ya "yeg" xəbəri ilə bitən misraların xəbərlik əlaməti qəbul etmədən işlənməsi də belə faktlardandır:

*Qonuğu gəlməyən evlər yıqılsa, yeg!*
*At yeməyən acı otlar bitincə, bitməsə, yeg!*
*Adam içməz acı sular sızınca, sızmasa, yeg!...*
*Yalan söz bu dünyada olunca, olmasa, yeg! (3, 20).*

Dünya xalqlarının fikir dünyasında türk dilləri haqqında qısqanclıqdan doğan mülahizələrdən başqa, çox qiymətli kəlamlar da var. "Bir qədim Çin müdriki yaxşı deyib: elə bil, türk dilini Tanrı özü fikirləşib tapıb ki, adamlar üçün asan və gözəl dil örnəyi olsun" (4, 267).

"Kitabi-Dədə Qorqud"un dilindən çox deyilib, çox yazılıb. Lakin fikrimizcə, hələ də Dədə Qorqud sözlərinin rəngləri yetərincə açılmayıb. Sözlərin rəngindən başqa, dastanın dilində tanıyıb bildiyimiz rənglərin də çoxlu üslub keyfiyyəti vardır. Məsələn "qara" və ya "sarı" rəng bildirən sözün iştirakı ilə yaranan Qaragünə, Qarabudaq, Qaraca Çoban, Sarı Qalmaş, Sarı Çoban və s. Dastanın dilində "qara" sözünün işlənmə məqamları çoxdur. Niyə qara? Bəlkə ona görə ki, qara güc və əzəmət rəmzidir? Ancaq axı onun mənfi çaları da var. El ağzında "qara gün", "qara bəxt", "qaraqabaq", "qaradaban", "qarayaylıq" söz və ifadələri də var. Qara rəng fikri yazı növündə "yas", "yaslı" mənalarını bildirir, həmin rəngdə paltar geyinənin yaslı olduğu anlaşılır. Dastanlardakı Qara Məlik də mənfi surətdir. Bayındır xandan gələn əmrə əsasən Dirsə xanı qara otağa dəvət edirlər, altına qara keçə döşəyirlər, qara qoyun ətindən yemək verirlər. Ağ və qızılı otağa dəvət edilmədiyi və övladsızlığı ucbatından qara otağa gətirildiyi üçün Dirsə xan pərt olur. Dahi Nizaminin "Xəmsə"sinə daxil olan dördüncü poemada – "Yeddi gözəl"də şənbə günü Bəhrama nağıl danışan qara geyimli hind qızıdır. Və onun danışdığı nağıl "Qara geyimli şahzadənin nağılı"dır. Və ya niyə sarı? Sarının da müsbət və mənfi çalarları vardır. Açıq-sarı bəzən insana rahatlıq gətirsə də, həm də kədər və həsrətin rəmzidir. Və o, spektrin insana əsəb gətirən ilkin rənglərindəndir. Sarı Qalmaş dastanın "Salur Qazanın evi yağmalandığı boyı bəyan edər" hissəsində düşmən qüvvələri ilə mübarizədə həlak olan ilk şəhiddir. Sarı Çoban isə "oğuz elinin başına bəla gətirən" şəxsdir, Təpəgözün atasıdır. Ən qədim, yaşı bilinməyən xalq

mahnılarından biri "Sarı gəlin" adlanır. Nizaminin sözügedən əsərində sarı geyimli şahzadə bazar günü Bəhrama nağıl deyir və sarı günbəddə. Şənbə və bazar günləri təqvimə görə bir-birinə yaxındır, bir-birinin ardınca gəlir. Spektrdə (el arasında ona "Fatma nənənin hanası" deyirlər) isə "qara" adlı rəng yoxdur, onun rəngləri qırmızıdan başlayır. Və ya göy rəngin hansı anlamı daha təsirlidir? Qazan xanın qardaşı Qaragünə Göy bədəvi ata minir. Xızır peyğəmbər Boz atın belində Buğacın gözünə görünür. Həm "Kitabi-Dədə Qorqud"un dilində, həm də sonra və indi də rənglər sirli olaraq qalır. Sənətdə onların çox sirri açılıb. Dildə isə nə qədər yazılsa da, onların fəlsəfi anlamı hələ də qaranlıqdır ("Qaranlıq" sözündə də "qara" var). XX yüzillikdə Xalq şairi (və mənalar şairi!) Rəsul Rza 32 şeirdən ibarət "Rənglər" silsiləsi yaratdı, rənglərin insan həyatındakı anlam çalarlarından yazdı. Ancaq yenə də rənglərin bədii dildəki üslub məqamlarının hamısı açılmayıb. Dədəmizin dilində də, sonra da, indi də rənglərin dildəki sehrinə, sirrinə azdan-çoxdan bələdik, lakin onlar haqqında hələ də hər şey deyilməyib. Və fikrimizcə, "Kitabi-Dədə Qorqud"un dili də yetərincə "kəşf" olunmayıb.Dədə Qorqud sözünün yaddaşında qədim ellərimizin, uluslarımızın ürək hərarəti, vətən sevgisi, bir qıy vuranda dağlarında, qayalarında oğulların atlarının nalından qopan daşların səsi, bir qılınc çəkəndə göydə şimşəkləri heyrətdə qoyan ərənlərimizin, alp igidlərimizin nəfəsi, ucu-bucağı görünməyən torpaqlarımızın həsrəti və daha nələr, nələr yaşayır."Kitabi-Dədə Qorqud" dastanını "milli varlığımızın mötəbər qaynağı" kimi dəyərləndirən ümummilli liderimiz Heydər Əliyev deyirdi: Bizim zəngin tariximiz, qədim mədəniyyətimiz və milli-mənəvi dəyərlərimiz "Kitabi-Dədə Qorqud" eposunda öz əksini tapmışdır. Bu epos bizim ümumi sərvətimizdir və hər bir azərbaycanlı onunla haqlı olaraq fəxr edə bilər. Dastanın məzmununu, mənasını, onun hər kəlməsini hər bir azərbaycanlı məktəbdən başlayaraq bilməlidir. Bu, bizim ana kitabımızdır və gənclik bu kitabı nə qədər dərindən bilsə, millətini, xalqını, vətənini, müstəqil Azərbaycanı bir o qədər də çox sevəcəkdir.

Bu gün Dədə Qorqud sözünün mahiyyətini, gərəyini dərk edən hər bir xalq belə bir abidənin sahibi olmadığına təəssüf edər. Çoxları istəyər ki, Dədə Qorqud onların olsun. Təkcə elə "Ana haqqı Tanrı haqqıdır" kəlamı "Cənnət anaların ayağı altındadır" deyən peyğəmbərimizin məşhur kəlamı məzənnəsindədir. Bu dastanlar, həm də bizim qədim əxlaq kodeksimizdir. Beləliklə, "Kitabi-Dədə Qorqud" dastanının dili fəlsəfi fikir tariximizin, dil tariximizin, təfəkkür və nitq mədəniyyətimizin bənzərsiz sərvətidir.

### *ƏDƏBİYYAT*

1. *Aydın. Yaranan söz, yaşadan söz, yanan söz (ön söz) / Vəliyev K. Sözün sehri. Bakı, Yazıçı, 1986.*
2. *Hacıyev T, "Dədə-Qorqud" kitabı ilk yazılı yaddaşımızdır / Kitabi-Dədə Qorqud. Bakı, Öndər-Nəşriyyat, 2004.*
3. *Kitabi-Dədə Qorqud. Bakı, Öndər-Nəşriyyat, 2004.*
4. *Vəliyev K, Sözün sehri. Bakı, Yazıçı, 1986.*

# AZƏRBAYCAN DİLİ FƏNNİNDƏN AÇIQ DƏRSLƏRİN TƏŞKİLİNƏ VERİLƏN DİDAKTİK TƏLƏBLƏR

**Fikrət XALIQOV,**
**filologiya elmləri doktoru, professor,**
**Vaqif QURBANOV,**
**pedaqoji elmlər doktoru, dosent**

Biz bu məqalədə “Azərbaycan dili” və “Nitq mədəniyyəti” fənləri üzrə müasir açıq dərslərin təşkilinə verilən didaktik tələblərdən bəhs etməyi qarşıya məqsəd qoymuşuq.

Böyük rus pedaqoqu K.D.Uşinskinin pedaqoji görüşlərində nümunəvi dərslərin aparılması məsələlərindən az bəhs edilməmişdir. Görkəmli didaktikin yaradıcılığında Ana dili dərslərinin təlim dili dərsləri olaraq açıq qurulmasının əhəmiyyəti ona görə dəfələrlə vurğulanır ki, o özü belə dərslərin mahir təşkilatçısı olmuşdur. [1]. Belə dərslərin əhəmiyyətini yüksək qiymətləndirməkdə məqsəd odur ki, şagirdlər müşahidəçilər qarşısında sərbəst danışır, sərbəst fikri ifadə imkanlarına adət etmiş olurlar.

K.D.Uşinski zamanında açıq dərslər ibtidai, orta, habelə, lisey, gimnaziya, seminariya və ali məktəblərdə, akademiyalarda da təşkil edilər və onların nəticələri də didaktika elmini zənginləşdirərdi. [2].

Açıq dərs-düşünülmüş şəkildə hazırlanan, ölçülüb-biçilən, məzmunca maraqlı, metodik cəhətdən nitq və təfəkkür fəallığına əsaslanan, metodik yeniliklərlə nəticələnən, habelə, ədəbi-bədii axşamlara giriş qapıları açılan dərslərə deyilir.

Vaxtilə Azərbaycan ziyalılarının böyük bir ordusunun təhsil aldığı Qori Müəllimlər Seminariyasında gələcək pedaqoqlarımızın, musiqişünaslarımızın, yazıçılarımızın müəllimləri qabaqcıl olduqları üçün açıq dərsləri də onlara həvalə edərdilər. Azərbaycan ziyalıları tarixində “ana dili aşiqi” kimi müqəddəs adla məşhur olan Firudin bəy Köçərli, Aleksey Osipoviç Çernyayevski açıq dərslərə dair elmi-metodik seminarlar, konfranslar keçirirlərmiş. Bu ənənə son vaxtlara qədər davam etmişdir. [3].

Görkəmli metodist-dilçi mərhum professor Əziz Əfəndizadənin rəhbərlik etdiyi elmi-praktik konfranslardan əvvəl tədbir iştirakçıları açıq dərslərdə iştirak edərdilər.Vaxtilə belə tədbirlər Bakıda, habelə, Şəki, Yevlax rayon, Biləcəri qəsəbə məktəblərində keçirilmişdir.

Keçən əsrin 80-ci illərində Bakı şəhərinin 132, 190 saylı orta məktəblərində keçirilən açıq dərslərin təhlilində akademik Mehdi Mehdizadə, professorlar Ə.Əfəndizadə, Ş.Mikayılov, B.Əhmədov, A.Babayev dərin təhlillər vermiş və bu fikirlər pedaqoji mətbuatda işıqlandırılmış, geniş əks-səda doğurmuşdur. Açıq dərslərin təhlili və qiymətləndirilməsi müəllimlərimizin pedaqoji fəallığının yüksəldilməsində çox mühüm rol oynamışdır.

Bəs açıq dərslərin xarakteri necə olur, onun təşkilində hansı məqsədlər güdülür və hansı vəzifələri həyata keçirmək nəzərdə tutulur?

Kurikulum metodologiyasına qədər, bildiyimiz kimi, dərslərdə istər ibtidai, orta, istərsə də ali məktəblərdə müəllimin fəallığı şagird və ya tələbələrin isə bir qayda olaraq qeyri-fəallığı müşahidə edilərdi. Bu cəhət ümumi bəla olduğuna görə, metodistlər açıq dərsləri də həmin problemin aradan qaldırılması yollarını axtarmaqda görürdülər. Başlıca diqqət ona yönəldilirdi ki, dərs şagird və ya tələbələrin təlim fəallığı şəraitində keçsin. Bu yolla həm nitq, həm də təfəkkür fəallığını təmin etmək mümkün olsun. Həmişə öz dərslərinin məzmunca maraqlı və metodlarını təkmil görmək istəyən müəllimlər dərs prosesinin intensivlik əmsalının yüksəldilməsi barədə düşünürdülər. Nəticələr də çox vaxt səmərəli və ya optimal hesab olunardı.

Açıq dərslər keçirən müəllimlər şagirdlərin təlim fəallığını təmin etməkdən əlavə, təlimə kompleks yanaşma, texniki təlim texnologiyaları və ya metodlarından fəndaxili və fənlərarası əlaqələrdən səmərəli istifadəni nümayiş etdirmək, optimal nəticələr əldə etmək kimi məqsəd və vəzifələri həyata keçirməyi nəzərdə tuturdular. Əlbəttə,açıq dərslərə verilən tələblər ciddi olardı. Əyanilik, xüsusən də TTV (Texniki Təlim Vasitələri), eyni zamanda fonotekalar, daha sonra İKT (İnformasiya-Kommunikasiya-Texnologiyal arı) də buraya əlavə edilərdi. Yalnız şagirdəri axtarışlara, kəşflərə, optimal nəticələrə istiqamətləndirən dərslərin didaktik üstünlüklərindən danışmaq mümkündür.

Hal-hazırda təhsil müəssisələrində "interaktiv" metodların tətbiqi ilə qarşılıqlı fəallıq demək olar ki, təmin edilmək üzrədir. I-VIII siniflərdə inteqrativ kurikulum dərsləri interaktiv metodlarla tədris edilir. Dərsliklərin, metodik vəsaitlərin didaktik imkanları xeyli genişlənmişdir. Müəllimin istifadəsində olan metodik vəsait də hər bir dərsin təlim ardıcıllığı motivasiyadan başlayaraq, ta qiymətləndirməyə qədər verilir. Standartların necə gerçəkləşdirilməsi üçün istifadə ediləcək əyaniliklər, o cümlədən, slaydlar, monitorlar, interaktiv lövhə və s. vəsaitdə göstərilirsə, belə şəraitdə açıq dərslər qurub standartları reallaşdırmaqda yüksək mənimsəmə əldə etmək mümkündür. Ancaq bunun üçün dərsliyə, metodik vəsaitə və təlim texnologiyalarına innovativ yanaşmağımız tələb olunur:

1. Açıq dərslər üçün mövzu seçərkən didaktik imkanlar nəzərə alınır. Orta məktəbdə 45, ali məktəbdə 80 dəqiqə ərzində təlim prosesi optimal təlim fəallığı şəraitində keçirilir. Dərs maraq, həvəs, şən ovqat, bir sözlə, nikbinlik pedaqogikasına uyğun qurulur. Azərbaycan dili dərslərində oxu, nitq, sual-cavab-yazı, habelə, normativ (dil qaydaları) məzmun xətlərində dinləyib anlama və danışmada ədəbi tələffüz normaları gözlənilir. Şagirdlərin oxusu və danışığının vahid nitq rejiminin tələblərinə tam uyğun olması üçün dərsdə işlər aparılır.

2. Rabitəli mətn üzərində iş məzmun, dil, üslub və digər halları əhatə edir.

3. Rabitəli mətnin məzmun və orada ifadə olunan ideya, problem baxımındann təhlil olunur.

4. Rabitəli mətn ifadə mətnidir, onun məzmununun söylənilməsi tələb edilir, reokonstruksiya olunmaqla inşa və ya esselərə çevrilir və bundan sonra son qiymətləndirmələr keçirilir.

Ümumtəhsildə açıq dərslərin təşkilinə yeni resurslardan, vasitələrdən bəhrələnməklə nail olmaq mümkündür. Dörd

məzmun xətti üzrə standartların əsasında qurulan dərs qruplarla iş formasında, liderlərin fəallığı şəraitində keçməsi qrupların bir-birinin qiymətləndirilməsində obyektivlik göstərməsi, nümunəvi təlim fəallıqlarının qeyd edilməsi, gözlənilən nəticələrlə son nəticələrin müqayisəsi müəllimin uğur gətirən cəhətlərindəndir.

Ali pedaqoji təhsildə belə imkanlar (kurikulum dərslikləri, metodik vəsaitləri) yoxdur. Bəs açıq dərsləri müəllim necə təşkil etməli və bu sahədə ali məktəb didaktikası necə təkmilləşdirilməlidir?

Bu suala cavab vermək və ya nümunəvi açıq dərs qurmaq üçün aşağıdakı qeydlərə diqqət yetirmək lazımdır:

**Fənn:** Nitq mədəniyyəti və natiqlik sənətinin əsasları

**Mövzu:** Heydər Əliyev siyasi natiqliyi

**Resurslar:** Dərs vəsaiti, kompüter, slaydlar, kliplər.

**Dərsin forması:** mühazirə

**Metodu:** interaktiv, inteqrativ

**Dərsin gedişi:** Müəllim tələbələrə açıq dərsi müşahdə edənlər haqqında informasiya verir. Xoş əhval ruhiyyə yaradaraq müşahidəçilərin nələrə diqqət yetirəcəklərini tələbələrin nəzərinə çatdırır. Göstərir ki, müşahidəçilər sizin nitqinizə, natiqliyinizə, Heydər Əliyev natiqliyinin fenomenallığına dair qeydlərini, habelə, idraki fəallıq göstərib müəllimlə dialoqa girmək bacarıqlarınıza qiymət verəcəklər.

Müəllim tələbələrə siyasi natiqlər kimlərə deyilir? - sualı ilə müraciət edir: Qərb və Şərq siyasi natiqləri haqqında tələbələrin məlum biliyi, fikri dinlənilir.

Bu cavablardan sonra müəllim dəqiqləşdirici suallar verir. Monitorda slaydlar ardıcıllıqla verilir. Slaydların aşağısında informasiyaları tələbələr özləri oxuya bilirlər.

-Demosfenin siyasi natiq olmasını necə izah edərdiniz?

-Mark Tuli Sisseron hansı əsərinə görə siyasi natiq sayılır?

-Atatürkün siyasi natiqliyi nələrlə əlaqədardır?

-N.Nərimanovun hansı nitqləri siyasi xarakter daşıyır?

-M.Ə.Rəsulzadə siyasi natiqliyinin başlıca xüsusiyyətləri hansılardır?

-İ.Stalin D.Ruzvelt, U.Çörçil siyasi natiqliyi haqqında fikirlər nələrdən ibarətdir?

Bu suallar əsasında tələbələrin nitq və təfəkkür fəallığı yaradılır. Mühazirəçi tələbələrə belə bir ritorik sualla müaciət edir:

Azərbaycan xalqının Ümummilli lideri Heydər Əliyevin bütün dünyada əks-səda doğuran və geniş rezonansa səbəb olan "neft siyasəti" haqqında nə bilirsiniz?

Monitorda klip əks olunur.

1994-cü ildə neft kontraktlarınının imzalaması və Heydər Əliyevin çıxışı nümayiş olunur.

Müəllim Xəzərin Karbohidrogen yataqlarının istismarına qoşulan dövlətlərin nümayəndələrinə bu kontraktların məna və əhəmiyyətinə dair müraciəti səsləndirilir.

"Neft siyasəti" açıqlandıqdan sonra H.Əliyevin beynəlxalq siyasəti və daxili siyasəti açıqlanır.

Azərbaycan Respublikasının dövlətçilik ideologiyasının prinsipləri nümayiş etdirilərək şərh olunur.

Müəllim ümummilli liderin təhsil siyasətindən danışarkən rəhbərin dilindən deyilmiş, şüarlara çevrilmiş cümlələri göstərir və şərh edir:

"Təhsil millətin gələcəyidir";

"Mədəniyyəti yüksək olan xalq həmişə inkişaf edəcək, həmişə irəli gedəcək";

"Mən həmişə fəxr etmişəm və indi də fəxr edirəm ki, mən azərbaycanlıyam";

"Mən sadə Azərbaycan vətəndaşıyam bununla fəxr edirəm. "Ancaq bundan yüksək olan ad var, o da müəllimlikdir";

"Müəllimlər Azərbaycan ziyalılarının ən etibarlı dəstəsidir";

Mühazirənin sonunda müəllim dərsi belə yekunlaşdırır;

Azərbaycanın bugünki inkişafında və onun nüfuzunun yüksəlməsində Heydər Əliyev siyasətinin rolu ölçüyəgəlməzdir. Bizim vəzifəmiz onun siyasətini öyrənməkdən və fəaliyyətimizdə əsas götürməkdən ibarətdir.

Sonda tələbələrə çıxış üçün söz də verilə bilər. Onlar bu mühazirədən yeni nə öyrəndiklərini deyə bilərlər.

Açıq dərs sona yetir. Onun təhlili keçirilir, qiymətləndirilir və sənədləşdirilib saxlanılır.

Beləliklə, biz bir daha təsdiq etmək istəyirik ki, açıq dərslər müəllim fəaliyyətinin güzgüsü kimi qiymətləndirilir. Açıq dərsləri lentə alıb gənc müəllimlərə nümayiş etdirmək isə olduqca faydalıdır.

### *ƏDƏBİYYAT*

*1.Ушинский К.Д., « Избранные педагогические произведения».В., "Maarif", 1953.*

*2.Рустамов Ф.А., Иследование истории школы и педагогической мысли в Азербайджане/, "Азербайджан мектеби",1988, №12.*

*3.Рустамов Ф.А. Изучение педагогической носледия Н.Нариманова //"Азербайджан мектеби",1990, №4.*

*4.Ümumi təhsilin fənn standartları (I-XI siniflər), Bakı, 2012.*

**Oxucuların nəzərinə**

Jurnalımıza 2017-ci il üçün abunə yazılışı davam edir.

Bakı şəhəri üzrə abunə yazılmaq istəyənlər aşağıdakı mətbuat yayımı firmalarına müraciət edə bilərlər:

1. "Qasid". Ünvan: Cavadxan, 21; telefon: 4-93-16-43; 4-30-02-24
2. "Səma". Ünvan: H.Cavid, 9, mənzil 63; telefon: 4-94-09-59; 4-94-02-52
3. "Kaspi". Ünvan: Mətbuat pr., 25; telefon: 5-10-61-96
4. "Qaya". Ünvan: Akademik H.Əliyev küç., 82 "q";telefon: 5-64-63-45; 4-65-67-13

Rayonlarda isə abunəni Azərbaycan Mətbuat Yayımı İstehsalat Birliyinin yerli yayım şöbələri aparır.

***Redaksiya.***

# ƏMƏLİ YAZI İŞLƏRİNİN APARILMASI

**Humay ALIKİŞİYEVA,**
**ARTPİ-nin ümumi təhsilin və məktəbdənkənar təhsilin kurikulumu şöbəsinin böyük elmi işçisi**

Azərbaycanın tarixində artıq tələbyönümlü bir təhsil sistemi formalaşır. Cəmiyyətimizin ehtiyac və tələbatlarına uyğun belə bir təhsil sisteminin qurulmasında, demokratikləşdirmə, humanistləşdirmə, inteqrasiya, diferensiallaşdırma, fərdiləşdirmə, humanitarlaşdırma mühüm pedaqoji prinsiplər kimi nəzərə alınır. Şəxsiyyətin maraq və ehtiyaclarını, arzu və istəklərini əsas götürməklə təhsil alanların mənafeyinə xidmət göstərmək ön plana çəkilir. Bu gün kurikulumlarda yer tutan məzmun standartları şəxsiyyətyönümlü təhsilin nəticələri olmaqla inteqrativ xarakter daşıyır və dəyərləri ifadə edir. Bu dəyərlər uşaqların ümumi inkişafını, intellekt səviyyəsini müəyyənləşdirmək imkanı yaradır.

Şəxsiyyətyönümlü kurikulumlar bilavasitə həyati bacarıq və vərdişlərə üstünlük verilməsi ilə fərqlənir. Bu kurikuluma görə, insanın gələcək həyat fəaliyyətində lazım olacaq praktik bacarıq və vərdişlər əhatə edilir, onun əqli fəaliyyətlə bağlı qabiliyyətlərinin formalaşması ön plana çəkilir. Şəxsiyyətyönümlü kurikulumlar inteqrativ məzmunu ilə seçilir. Kurikulumda fənlərin adlandırılmasında, məzmunun müəyyənləşdirilməsində şəxsiyyətin formalaşması üçün əhəmiyyət kəsb edən və bilavasitə insanın şəxsi fəaliyyəti üçün lazım olan tələblər əsas götürülür.

Respublikamızın ümumtəhsil məktəblərində tədris olunan "Azərbaycan dili fənni üzrə təhsil proqramı (kurikulumu)" şəxsiyyətyönümlü olub, şagirdlərdə zəruri həyati bacarıqların formalaşmasına yönəldilmişdir. Hər təhsil səviyyəsində şagirdlərin yaş xüsusiyyəti nəzərə alınaraq, rəsmi-işgüzar sənədlərlə bağlı bacarıqlar məzmun standartlarında əksini tapmışdır.

Müasir dövrdə dərslər yeni təhsil sisteminin tələblərinə uyğun olaraq qurulmalı, şagirdlər bu standartlara cavab verə biləcək bir şəkildə yetişdirilməlidirlər. Azərbaycan dilinin tədrisi şagirdlər üçün başqa elmlərin mənimsədilməsi üsullarını müəyyənləşdirən, ona kömək edən bir açardır. Azərbaycan dili dərsləri xalqımızın mədəniyyət tarixinə dair şagirdlərin biliyini zənginləşdirməklə yanaşı, onlara fikri sərbəst, dəqiq və emosional ifadə etməyin yollarını öyrətməli, düzgün yazı, rabitəli şifahi və yazılı nitq vərdişləri aşılamalıdır.

Bu günün şagirdi sabahın müstəqil həyata atılan vətəndaşıdır. Həyatımızın hər anında qarşılaşdığımız, bizə gərəkli olan əməli yazı nümunələrinin tədrisi ən vacib və aktual problemlərdəndir. Əməli yazı nümunələri ibtidai siniflərdən başlayaraq tədris olunur. Lakin vəziyyəti öyrənərkən aydın olur ki, məktəbi bitirən şagirdlərimizin əksəriyyəti əməli yazı yazmaq bacarığına malik deyillər. Müasir dövrdə beynəlxalq iqtisadi əlaqələrin artdığı bir şəraitdə bu əlaqələri tənzimləmək üçün işgüzar yazışmalara ehtiyac duyulur. Bu onunla əlaqədardır ki, istənilən işgüzar danışıq öz yazılı təsdiqini tapmalıdır. İş sferası insan fəaliyyətinin vacib sahələrindən biridir. Məhz iş sənədlərinin, yazış-

maların köməyilə rəsmi, xidməti əlaqələr, əməkdaşlıq əlaqələri yaranır, müəssisələr, təşkilatlar, dövlətlər arasında münasibətlər tənzimlənir, həmçinin insanlar arasında şəxsi əlaqələr qaydaya salınır. Əməli yazı bacarığı həyatımızın tələbi və zəruri prosesidir. İbtidai siniflər üçün nəzərdə tutulmuş məzmun standartlarında öz əksini tapan əməli yazı bacarığını və bu bacarığı vərdişə çevirmək qabiliyyətini müəllim yaratmalıdır. Elan, ərizə, açıqca, dəvətnamə, məktub və məlumat kimi əməli yazılar tədris olunur. Demək, artıq ibtidai sinif şagirdində bu bacarıq formalaşdırılır. Əməli yazının ən sadə növləri olan elan və açıqca şagirdlərdə xüsusi bir günə maraq yaradaraq öyrədilə bilər. Məsələn, elan nümunəsi olaraq ibtidai sinif şagirdi:

Şagirdlərin nəzərinə! Sizi, 29.12.2015-ci il tarixdə məktəbin akt zalında keçiriləcək Yeni il şənliyinə dəvət edirik. Bu hadisəylə bağlı dəvətnamə də hazırlana bilər. Belə ki, şagird, valideyn yaxud digər bir məktəbin şagirdlərinə dəvətnamə yaza bilər:

Əziz dostum, Vüsal! Səni məktəbimizdə keçiriləcək Yeni il şənliyinə dəvət edirik. İştirakın məni və dostlarımızı sevindirər. Açıqca hazırlanması zamanı da şagirdlərə sadə bir açıqca yazdıraraq bu bacarığı yaratmaq üçün ilkin addımlar atmaq olar. Şagird ürəyi istədiyi bir şəxsə təbrik məzmunlu açıqca yaza bilər:

Əziz müəllimim! Sizi Yeni il bayramı münasibətilə təbrik edirəm. Sizə can sağlığı arzulayıram. İmza: Şagirdiniz Abbasova Gülər.

Bu yazılar artıq şagirddə ilkin bacarıqları formalaşdırmış olur. Yuxarı siniflərə qalxdıqca bu əməli yazılar daha da təkmilləşdirilərək tədris olunur. V-XI siniflər üçün Azərbaycan dili fənni üzrə təhsil proqramında (kurikulumda) əməli yazı nümunələri siniflər üzrə belə verilmişdir: V sinif üçün elan və məktub; VI sinif üçün ərizə və tərcümeyi-hal; VII sinif üçün izahat və teleqram; VIII sinif üçün arayış və protokol.

Əməli yazıların aparılma prosesini öyrənərkən aydın olur ki, şagirdlər sərbəst şəkildə əməli yazı (ərizə, izahat və s.) yazmaqda çətinlik çəkir, nümunə əsasında yazmağa həvəs göstərirlər.

Müəllimlər əməli yazılarla bağlı məzmun standartları gerçəkləşdirərkən “Müəllim üçün metodik vəsait”də verilmiş məlumatlara üstünlük verir. Şagirdlərə geniş şəkildə məlumat ötürülmür. Biliklərin bacarığa çevrilməsi istiqamətində yaradıcı xarakterli iş aparılmır. Təlim prosesində müvafiq şəraitə uyğun olaraq əməli yazılar tətbiq edilərsə, şagird sərbəst şəkildə bu yazı nümunələrində özünü ifadə edə bilər. Məsələn, ərizə əməli yazı nümunəsinin bacarığa çevrilməsi üçün şagirdlərin icazə xarakterli yazılarını ərizə formasında tələb etmək olar. Həyatımızın hər vacib anında qarşılaşdığımız bu əməli yazı bacarıqlarına məktəb dövründən vərdiş etmək lazımdır.

Verilmiş standart bütün tədris ili müddəti ərzində tətbiq olunaraq möhkəmləndirilməlidir.

Dərsliklərdə tez-tez təqdimat hazırlanması tapşırıqlarına rast gəlinir. Şagirdlərə təqdimat ilə bağlı aşağıdakı məlumatların verilməsi məqsədəuyğundur:

Təqdimat hazırlanması tapşırığı verərkən müəllim təqdimatın həm şifahi, həm də yazılı növü haqqında məlumat verməlidir. Belə ki, təqdimat rəsmi sənəd olaraq aşağı vəzifəli şəxsin yuxarı vəzifəli şəxs qarşısında hər hansı bir məsələni qaldırması, irəli sürməsi, xahiş etməsi zərurətin-

də yazılır. Təqdimat ərizə və tələbnamə deyil. Təqdimat ərizədən yuxarı, tələbnamədən aşağıda dayanan bir xahişnamədir. Məsələn, bir nəfərin mükafata, təqaüdə, vəzifəyə təqdim edilməsi. Təqdimat yalnız xoş niyyətlər üçün yazılmır. Eyni zamanda, hər hansı bir səbəbdən işçi yuxarı qurumun rəhbəri qarşısında məsələ qaldırır – təqdimat yazır. Cəza tədbiri əmr formasında icra edildikdə əmrdə kimin təqdimatı əsasında cəza verildiyi göstərilir. Və yaxud yuxarı qurumun iclasında müzakirə edildikdə təqdimatın tam mətni oxunur. Yazıdan da göründüyü kimi bu dərsdə təqdimatın ərizə ilə fərqi izah edilməli, praktik iş aparılmalıdır. Nümunə: Nərimanov Rayon Təhsil Şöbəsinin müdiri Mahal Əliyevə.

**Təqdimat**

Məktəbimizin tarix müəllimi, tarix elmləri namizədi Nüsrət Cəbrayılov uzun müddətdir ki, bu kollektivdə çalışır. Bu günlərdə onun pedaqoji fəaliyyətinin 50 ili tamam olur. N.Cəbrayılov fəaliyyət göstərdiyi müddətdə həmişə özünün pedaqoji işi ilə digərlərindən fərqlənmiş, gənc müəllimlərə metodik köməyini əsirgəməmişdir. Onun şagirdləri rayon və respublika üzrə keçirilən olimpiadaların qalibləri olmuşlar. Qocaman müəllimin dərs dediyi şagirdlər bu gün Respublikamızın müxtəlif elmi idarələrində, istehsalat müəssisələrində şərəflə çalışırlar. N.Cəbrayılov pedoqoji fəaliyyəti ərzində həm də elmi işlə məşğul olmuşdur. O, bir neçə elmi metodik vəsaitin müəllifidir. Bunları nəzərə alaraq N.Cəbrayılova respublikanın «Əməkdar müəllimi» adı verilməsi üçün aidiyyatı təşkilatlar qarşısında məsələ qaldırmanız xahiş olunur.

*Məktəbin direktoru: Rüfət Ağayev*
*18 mart 2006-cı il*

Dərsliklərdə verilən təqdimat tapşırıqları əsasən şifahi təqdimatlardır. Şifahi təqdimatlar zamanı vaxta qənaət, vaxtın dəqiq və düzgün bölüşdürülməsi diqqətdə saxlanılmalıdır. Təqdimat edən şəxs uzunçuluğa yol verməməlidir. Fikrini vaxt çərçivəsində izah etməli, sonadək maraq yaratmalıdır. Yazı şəklinə gəldikdə isə aydın, rahat oxunan olmalı, animasiyalardan az istifadə olunmalı, video-slayd şəklində tərtibat daha məqsədəuyğundur. Şagird təqdimatın planını beynində qurmalı, əsas fikri lakonik, konkret şəkildə çatdırmalıdır. Təqdimatın hazırlanması zamanı şagirdlərin İKT bacarıqlarına malik olmaları da mühüm şərtlərdəndir.
Digər bir əməli yazı olan izahatı şagirdlərin gündəlik məktəb həyatı ilə əlaqəli şəkildə tədris etmək daha faydalıdır. Belə ki, müəyyən səbəblərdən dərsdə iştirak edə bilməyən şagirddən bu səbəb izahat şəklində alınarsa, daha gözəl nəticə əldə olunar. İzahat yazılarkən mətnin ayrı – ayrı hissələri arasındakı əlaqənin əsas götürülməsi, baş vermiş hadisəylə bağlı fikrin dəqiq, aydın və əhatəli çatdırılmasının vacibliyi tədris olunmalıdır. İzahat yazılarkən hər hansı bir hadisənin izahı ilə yanaşı şagird burda sübut olaraq hər hansı bir dəlil də gətirə bilər. Məsələn, idman məşğələsində iştirak etdiyinə görə dərs buraxan şagird arayışı izahatına əlavə edə bilər.

Ərizə ən çox istifadə olunan əməli yazıdır. Şagirdlərə ərizə məzmunca iki cür - şikayət və xahiş ərizəsi olduğu öyrədilməlidir. Ərizə vərəqin sol tərəfindən 4 - 5 sm buraxılmaqla ortadan başlanır. İlk cümlədə müraciət olunan şəxsin vəzifəsi, titulu, adının və atasının adının baş hərfləri

və soyadı yazılır. Ondan sonra ərizə verən öz kimliyini, (vəzifəsini) adını, atasının adını və soyadını bütövlükdə yazır. Bundan sonra isə vərəqin ortasında "ƏRİZƏ" sözünü yazır. Abzasdan ərizənin məzmunu başlanır. Ərizəçi öz mətləbini bildirdikdən sonra aşağıda imza edir və sonda aşağıda ayın tarixini göstərir.

Ərizənin xüsusiyyətləri:

1.Ərizə əllə yazılır.

2.Qaralama və ya düzəliş olmaz.

3.Vahid nümunə əsasında yazılmalıdır.

4.Sənədin dili qısa və aydın olmalıdır.

6. I şəxsə müraciət zamanı ilk hərf böyük yazılır.

7. Saylar rəqəmlə yazılır.

Yeni qəbul olunmuş qaydalara əsasən "tərəfindən" sözü işlədilməməlidir.

Gündəlik həyatımızda daha çox rastlaşdığımız elanlar haqqında şagirdlərə məlumat verərəkən televiziya, radio, qəzet və internet səhifələrindən də nümunələr seçmək olar. Elan nümunəsi hazırlanarkən diqqət verilməli məqam: elandakı mətn nə qədər diqqət çəkən olarsa, bir o qədər maraq hissi oyadar. Elan nümunəsi:

Məktəblilər üçün xarici dil kurslarına 15 % endirimin:

Son günü!!!

Qeydiyyatdan keçməyə tələsin!

Belə fürsət bir daha ələ düşməz!

Tərcümeyi-hal əməli yazı növünü də şagirdlərdə bacarıq halına çevirmək lazımdır. Bu yazı nümunəsini ildən - ilə inkişaf etdirmək olar. Müəllim şagirdə tərcümeyi- halın nə üçün lazım olduğunu əsaslandıraraq izah etməlidir. Şagird bilməlidir ki, yazdığı tərcümeyi-hal qarşı tərəfdə onun haqqında formalaşan ilk fikirdir. Müasir inkişafla bağlı günümüzdə CV nümunələrindən də geniş istifadə olunur. Müşahidələr göstərir ki, şagirdlər bəzən bu iki yazı nümunələrini qarışdırırlar. Müəllimlər ilk növbədə CV ilə tərcümeyihalın fərqli xüsusiyyətlərini izah etməlidirlər. Belə ki, CV-i sırf işəgötürənin maraqları üzərində qurulur və burda şəxsin yalnız şəxsi məlumatları əks olunur.

Məktub və teleqram öyrədilərkən onların oxşar və fərqli cəhətləri üzərində dərsi təşkil etməklə gələcəkdə bu vərdişin bacarığa çevrilməsinə nail olmaq olar. Məktub - gündəlik həyatımızda istifadəsi qaçılmaz olan əməli yazı nümunəsidir. Məzmunundan asılı olmayaraq hər bir şəxs ömründə bir dəfə də olsa, məktub yazır. Məktəblilərə məktubun yazılma qaydaları öyrədilərkən ilk öncə forması barədə ilkin anlayış yaradılmalıdır. Daha sonra texniki tərtibat məsələləri aydın şəkildə izah edilərək, bu məqamın vacibliyi qeyd olunmalıdır. Şagird əvvəlcə məktubun məzmununu müəyyənləşdirməli, kimə və hara yazacağını dəqiqləşdirməlidir. Məktubun məzmununa uyğun olaraq yönləndirilmə və məlumatlandırma müəllimin vəzifəsidir. Məktub rəsmi və ya hörmətli bir şəxsə yazılırsa, şagirdə riayət etməli olduğu ədəb və nəzakət qaydaları öyrədilməlidir. Məktubun mətni belə bir sistemə salına bilər:

1. Müraciət hissəsi.

2. Ümumi hissə.

3. Fərqləndirici hissə.

4. Yekunlaşdırıcı hissə.

Şagirdlərin məktub yazarkən çətinlik çəkdikləri bir yer də zərfin doldurulma prosesidir. Müəllim xüsusi olaraq zərfin doldurulması ilə bağlı sinifdə iş aparmalıdır. Məktub haraya göndərilir?, "Məktub kimə çatacaq?", "Məktub haradan və kim tərəfindən göndərilib?" kimi suallar üzərində iş aparılmalıdır. Bundan əlavə şagirdlərə məktubun digər bir növü - rəsmi

məktub haqqında da məlumat vermək lazımdır. İşgüzar məktubları adətən bir səhifə həcmində yazırlar. Əgər məktub bir neçə səhifədən ibarətdirsə, birincidən başqa, digər bütün səhifələr ərəb rəqəmləri ilə nömrələnir. İşgüzar məktublar xüsusi blanklarda sənədləşdirilir. Onların üzərində şirkətin emblemi, tam adı, poçt ünvanı, telefonlar və bank rekvizitləri göstərilir. Məzmunundan asılı olaraq, yazı kağızlarında da bu məktublar sənədləşdirilə bilər. Bəzi vacib işgüzar məktubları bükmürlər, xüsusi böyük zərflərdə göndərirlər. Böyük müasir şirkətlərin xüsusi şəffaf pəncərəcikli zərfləri olur. Belə zərflərdə ünvan yazılmır. İşgüzar məktubları əllə yazmırlar. Onlar mütləq çap olunmalıdırlar. Fənlərarası inteqrasiyadan istifadə edərək – məktubun tədrisi zamanı ədəbiyyat fənnindən keçilən hər hansı bir əsərin bir obrazına məktub yazılaraq bu əməli yazını yaddaşda möhkəmləndirmək olar. Teleqram yazılması qaydalarının öyrədilməsi zamanı fikrin dəqiq, lokonik ifadəsi şagirdlərə öyrədilməlidir. Şagirdlərə bir və iki cümlə daxilində fikrin ifadə bacarığı aşılanmalıdır.

Arayış hayatımızda tez-tez müraciət etdiyimiz əməli yazı növüdür. Belə ki, şagirdlər arasında idmanla, musiqi və digər məktəbdənkənar məşğələlərlə məşğul olanlara arayış verərkən bunu əyani şəkildə şagirdlərə də təqdim etmək olar. Nümunə:

**Arayış**

Verilir, ondan ötrü ki, həqiqətən də, Anar Məmmədov Akif oğlu 2012-ci ilin sentyabr ayından “Zirvə” idman kompleksində cüdo idman növü ilə məşğul olur. Arayış 1 nömrəli məktəbin rəhbərliyinə təqdim etmək üçün verilir.

İmza: Tarix

Protokolun yazılışı zamanı qarşıda duran əsas tələblər:

1. Protokol və onun nömrəsi vərəqin ortasında böyük hərflə yazılır.
2. Təşkilatın adı, tarix və keçirildiyi yer qeyd olunur.
3. İclasda iştirak edənlərin sayı göstərilir.
4. Yığıncağı idarə etmək üçün sədr və katib seçilir.
5. Gündəlik məsələlər qeyd olunur.
6. Vərəqin ortasında “Eşidildi” sözü yazılır və müzakirə ediləcək məsələ qeyd olunur.
7. “Çıxış etdilər” sözü yazılır, edilən çıxışların qısa məzmunu qeyd olunur.
8. Qərar.
9. Protokolun sonunda sədr və katib imza edir.

Məktəb praktikasında protokolu şagirdlərə valideyn iclası zamanı öyrətmək olar. İclasın katibi seçilərək bu yazı nümunəsini reallaşdırmaq olar.

Əməli yazılar müqayisəli şəkildə, məktəb tədbirlərinin təşkili zamanı, sinifdə bu nümunələrdən ibarət guşə yaradılaraq tədris olunarsa, gözəl nəticə əldə etmək olar. Gündəlik həyatımızda tez-tez müraciət olunan əməli yazılar texnologiyadır. Müəllim bu yazı növündən texnologiya kimi istifadə edərsə, şagirdlərdə əməli yazı ilə bağlı bacarıqlar vərdişə çevrilər.

# ALİ MƏKTƏBDƏ FÜZULİ LİRİKASININ TƏDRİSİ

**Yaqub BABAYEV,**
**filologiya elmləri doktoru, professor**

Bədii sözün sehrkarı olan M.Füzuli kürəvi masştabda lirik poeziyanın ən istedadlı nümayəndələrindən biri kimi tanınır. O, özünün dediyi kimi *«şairi-Museyi-kəlam» («Musa kəlam şair»)* kimi sözdən möcüzə yaratmış, bənzərsiz lirik (həm də epik) əsərlər müəllifi olaraq dünya poeziyasının iftixarına çevrilən sənətkarlar sırasında ön mövqedə qərar tutmuşdur. Bədii söz istər məna-məzmun, istər forma, istər dil-üslub gözəlliyi, istər musiqi ahəngi və çaları, istər estetikası, istər «söz oyunu» və məcazlar sistemi, istər məntiqi rabitə və mətndaxili vəhdət və s. baxımından özünün ən uca, şərəfli və inanılmaz səviyyəsinə məhz bu Azərbaycan sənətkarının qələmi ilə yüksəlmişdir.

Füzuli əhli-aləmə sözdən bənzərsiz bir süfrə açmış, üç dildə – türk (Azərbaycan türkcəsi), fars və ərəb dillərində misilsiz əsərlər ərsəyə gətirmişdir. «Fars divan»ındakı bir qitəsində dediyi kimi:

*Mən gözəl bir süfrə açdım sözdən əhli-aləmə,*
*Onda min zövq artıran hər dürlü nemət düzmüşəm.*
*Süfrəmə hər bir qonaq gəlsə, xəcalət çəkmərəm,*
*Fərqi yox, ya türk gəlsin, ya ərəb, yaxud əcəm.*
*Kim gəlir gəlsin, aparsın hər nə istər xatiri,*
*Qurtaran nemət deyil, süfrəmdən olmaz heç nə kəm.*

Dahi mütəfəkkir dediyimiz kimi, üç dildə əsərlər yazmışdır. Onun yaradıcılıq irsi bütövlükdə aşağıdakılardan ibarətdir: 1.Türkcə (Azərbaycan türkcəsi ilə) divan; 2.Farsca divan; 3.Qəsidələr divanı (Buraya daxil olan qəsidələr üç dildədir: türk, fars, ərəb). *Poemaları:* «Leyli və Məcnun» (türkcə); «Bəngü Badə» (türkcə); «Söhbətül-əsmar» (türkcə); «Həft cam» (farsca). *Nəsr əsərləri:* «Rindü Zahid» (farsca); «Səhhət və Mərəz» (farsca); «Nəsr məktubları» (türkcə); «Hədiqətüs-süəda» (türkcə). *Tərcüməsi:* «Hədisi-ərbəin». *Elmi-fəlsəfi traktatı:* «Mətləül-etiqad» (ərəbcə).

Deyildiyi kimi, Füzuli lirik şeirin böyük ustadıdır. O, klassik şərq poeziyasında əruz vəzninə mənsub populyar janr və bədii formaların, demək olar ki, əksəriyyətində qələmini sınamışdır. Qəzəl, qəsidə, mürəbbe, müxəmməs, müsəddəs, təxmis, müəmma, tərkibbənd, tərcibənd, qitə, rübai, məsnəvi və s. şairin müraciət etdiyi janr və bədii formalar sırasındadır.

Qəzəlləri. Füzuli klassik şərq lirikasının rəngarəng janrlarını sınaqdan keçirsə də, əsasən, qəzəl şairi kimi tanınır. Qəzəlin Füzuli nöqtəsi onun son uca nöqtəsi, zirvəsidir. Nə bu müqtədir ustada qədər, nə də ondan sonra heç kəs janrın bu yüksək səviyyəsini fəth edə bilməmişdir.

Qəzələ daha çox müraciət etməsinin səbəbini şair həm türkcə, həm də farsca divanlarının müqəddiməsində izah edir. Əvvələn, yaradıcılıq amalı və məfkurəsi, əsasən, məhəbbət üstündə köklənmiş sənətkarı janrın məhz bu hissin ifadəsi üçün qərarlaşmış və sabitləşmiş bədii deyim forması olması, yəni ideya-məzmun münasibliyi cəlb edirdi. Çünki şairin öz dili ilə desək, *«qəzəl aşiqin könül dərdini mərhəmətli sevgilisinə açması və ya*

*məşuqun öz halını sadiq aşiqinə bildirməsidir»*. Digər tərəfdən janrın başqa cəhətləri də şair üçün münasib görünürdü və o, bunu belə mənalandırırdı:

*Qəzəldir səfabəxşi-əhli-nəzər,*
*Qəzəldir güli-bustani-hünər.*
*Qəzali-qəzəl seydi asan degil,*
*Qəzəl münкiri əhli-irfan degil.*
*Qəzəl bildirir şairin qüdrətin,*
*Qəzəl artırır nazimin şöhrətin.*
*Кönül, gərçi əşarə çox rəsm var,*
*Qəzəl rəsmin et cümlədən ixtiyar*
*Кi, hər məhfilin ziynətidir ğəzəl,*
*Xirədməndlər sənətidir ğəzəl.*
*Qəzəl de кi, məşhuri-dövran ola,*
*Oxumaq da, yazmaq da asan ola.*

Füzuli qəzəllərinin mövzu dairəsini təxminən bu cür müəyyənləşdirməк mümкündür: eşq, məhəbbət şeirləri; gözəlin və gözəlliyin tərənnümü; dini qəzəllər; təsviri qəzəllər; ictimai mövzulu qəzəllər və s.

Sənətкarın qəzəllərinin mövzu qalareyasında əsas rəng və çalarlar məhəbbətlə bağlıdır. Məhəbbət Füzuli liriкasının rüкnünü, mayasını təşкil edir. O, hər şeydən əvvəl bir eşq şairi кimi tanınır. Bunun səbəbini də hamıdan yaxşı dahi mütəfəккir özü izah edir. Liriк «mən»inə müraciətlə bəyan edir кi, ondan mədh və məzəmmət şeirləri ummağa dəyməz. Aşiq olan кamal əhlinin sözü də aşiqanə olmalıdır:

*Məndən, Füzuli, istəmə əş'ari-mədhü zəmm,*
*Mən aşiqəm, həmişə sözüm aşiqanədir.*

Füzulinin Azərbaycan türкcəsində divanının ilк şeiri *«Qəd ənarəl...»* qəzəli də məhəbbət mövzusundadır.

*Qəd ənarəl-eşqə-lil-üşşaqi minhacəl hüda!*
*Saliкi-rahi-həqiqət eşqə eylər iqtida.*
*Eşqdir ol nəş'eyi-кamil кim, ondandır müdam*
*Meydə təşviri-hərarət, neydə tə'siri-səda.*
*Vadiyi-vəhdət həqiqətdə məqami-eşqdir*
*Кim, müşəxxəs olmaz ol vadidə sultandan gəda.*
*Eyləməz xəlvətsərayi-sirri-vəhdət məhrəmi,*
*Aşiqi mə'şuqdən, mə'şuqi aşiqdən cüda.*
*Ey кi, əhli-eşqə söylərsən: məlamət tərкin et!*
*Söylə кim, mümкünmüdür təğyiri-təqdiri-xuda?*
*Eşq кilкi çəкdi xətt hərfi-vücudi-aşiqə*
*Кim, ola sabit həq isbatında nəfyi-maəda.*
*Ey Füzuli, intihasız zövq buldun eşqdən;*
*Böylədir hər iş кi, həqq adilə qılsan ibtida.*

*Eşq aşiqlər üçün hidayət yolunu işıqlandırdı. Həqiqət yolunun saliкləri (sufizmdə: həqiqət yolçuları) ancaq eşq yolunu tutarlar (bu yolla gedərlər). Eşq o кamil nəşədir кi, meyin hərarətli yanğısı, neyin təsirli sədası ondandır. Vəhdət vadisi (sufizmdə: Haqqa qovuşmaq vadisi) həqiqətdə eşq məqamıdır кi, o vadidə sultanla gəda (yoxsul) fərqlənməz. Vəhdət sirrinin xəlvət sərayına məhrəm olan кəs (təsəvvüfdə: ilahi hiкmətlərə bələd olan şəxs) aşiqlə məşuqu bir-birindən ayırmaz. Ey eşq əhlinə irad tutan (eşq yolunu tutduğu səbəbindən onu qınayan), danlağı qurtar, söylə кi, Xudanın verdiyi qisməti (müəyyənləşdirdiyi taleyi) dəyişdirməк mümкündürmü? Eşq qələmi aşiq vücudunun hərfləri üzərindən xətt çəкdi кi, qalan şeylərin (Allahdan qeyri nə varsa, hər şeyin, masivanın) inкarı Haqqın isbatında sabit olsun. Ey Füzuli, eşqdən intəhasız*

*zövq aldın, Adil Haqqı başlanğıc кimi qəbul etsəк, hər iş belədir.*

Bu qəzəl bir növ Füzuli divanının bismillahıdır. Yəni şairin liriкasının əsas ideya yüкünü və mövzu istiqamətini özündə ehtiva edir. Həm də burada sufiyanə eşqdən söhbət gedir. Şair məhəbbətin mütəsəvvüf çalarını, yəni həqiqi eşqi əsas götürür. Həqiqət yolunun saliкi olmağı, vəhdət sirrinin xəlvət sarayına bələdliyi, varlıqda masivanı (Allahdan başqa qeyri şeylər) deyil, yalnız Haqqın özünün reallığını qəbul etməyi və bu idraкla da eşq zövqü ilə yaşamağı кamal əhli üçün əsas şərt sayır. Çünкi şair fəzilət və ariflıк yolunda eşqdən özgə bir yolun olduğunu təsəvvür etmir:

*Ey Füzuli, qılmazam tərкi-təriqi-eşq кim,*
*Bu fəzilət daxili-əhli-кəmal eylər məni.*

Dahi mütəfəккirimizin liriк qəhrəmanı eşqə ötəri dünyəvi həvəs кimi baxmır. Filosof təbiətli bu qəhrəman məsələyə irfani gözlə, daha geniş ölçüdə yanaşır. O, eşq qəminə giriftar olalı dünyanın azadəsidir *(«Giriftari-qəmi-eşq olalı azadeyi-dəhrəm»*, yəni mülк aləminin başqa bütün qayğılarından azaddır. Eşq dəryasına düşdüyü üçün dünya zövqünü unutmuşdur *(«Bəhri-eşqə düşdün, ey dil, zövqi-dünyanı unut»*. Elə buna görə də *«eşq zövqilə xoş»*dur. Onun fiкrincə cəhənnəm atəşinə yananların işi eşq atəşinə yananlardan daha asandır. Çünкi cəhənnəmdə yananlar atəşə bir dəfə yanıb canını qurtarır. Eşq atəşi isə daimi əzabdır. Ancaq cəfası nəşəlidir. Bu, liriк qəhrəmana təlqin olunan eşq səfası *(«səfayi-eşq»)* ibtidası sübhi-əzəldə, onun ruhunun yaranış çağında ehsan edilmiş əzəli bir qismətdir. Eşq dərdi bu aşiqdən ötrü o qədər ülvi bir hissdir кi, ona dərman etməк təşəbbüsündə bulunan кəs həmin aşiqin düşməni timsalındadır:

*Eşq dərdilə olur aşiq mizacı müstəqim,*
*Düşmənimdir, dustlar, bu dərdə dərman eyləyən.*

*«Məni candan usandırdı…»* qəzəli Füzulinin məhəbbət mövzulu liriк əsərləri içərisində xüsusi yer tutur. Şeir təsirli məzmuna, aydın ideyaya, axıcı dilə, gözəl üsluba, müкəmməl bədii formaya maliкdir. Müəllif burada məzmun və zahiri effeкtin mütənasib harmoniyasını yarada bilmişdir.

Qəzəl I şəxsin – liriк qəhrəmanın dilindən deyilir. Bu aşiq qəhrəmanın daxili hiss və canandan şiкayətlərini sadə və inandırıcı şəкildə ifadə edir. Şeirin mətlədən məqtəyə qədər bütünlüкlə bədii suallar və daxili qafiyə, yəni səc` üzərində qurulması onun poetiк aurasını daha da gözəlləşdirir. Aşiqin şiкayət və daxili təəssüratının bəyanı o qədər sadə, səmimi, həm də obrazlı şəкildə verilir кi, oxucunu inandırır. Onun duyğularına təsir edir, estetiк cəhətdən zövqünü oxşayır:

*Məni candan usandırdı, cəfadən yar usanmazmı?*
*Fələкlər yandı ahimdən, muradım şəm'i yanmazmı?*
*Qamu bimarinə canan dəvayi-dərd edər ehsan,*
*Neçün qılmaz mənə dərman, məni bimar sanmazmı?*

Məşuq eşq əzabının sürəкli iztirabını çəкən aşiqi canından bezdirmişdir. Onun ahı fələкləri yandırır (mübaliğə), arzularının şamı isə yanmır. Ancaq məşuq verdiyi cəfadan usanmır. Tənhalaşmış aşiqin şiкayəti həm də ondandır кi, canan onu sevən bütün dərdlilərinin (eşq xəstələrinin) dərdinə dəva ehsan edir. Yalnız bu aşiqə biganə yanaşır. Halbuкi onun sevgi yüкü başqalarından daha ağırdır. Təbii кi, burada canan dediкdə Allah nəzərdə tutulur.

Eşq qəmini pünhan saxlayan aşiq başqalarının məsləhəti ilə onu sevgilisinə açır. Ancaq ondan bir vəfa və кəramət görmür. «Şəbi-hicran»a *(«ayrılıq gecəsi»)* düşdüyü, yəni yardan ayrıldığı üçün onun işi ahü-fəğan, bu hicran möhnətinin cəfasını yaşamaqdır. Burada şair *«şəbi-hicran»* dedikdə öz ilкin zatından – ilahi aləmdən ayrılıb кəsrətə düşmüş zərrənin əhvalını nəzərdə tutur. Çünкi vəhdətdən ayrılıb maddi aləmə düşmüş zərrə bu ayrılıq səbəbindən fəryad edir. Öz əslinə – Yara qovuşmağa can atır. Verdiyimiz bu izahat sufizmdəкi eşq və «şəbi-hicran» fəlsəfəsi ilə bağlıdır. Belə кi, təsəvvüf düşüncəsinə görə öz əslindən ayrılıb fiziкi bədənlə qovuşmuş insan ruhu (ilahi «mən») maddi dünyada «şəbi-hicran»a düşür, əzaba giriftar olur və bunun fəryadını edir. Şair də qəzəldə məhz bunu nəzərdə tutur:

*Qəmim pünhan tutardım mən, dedilər yarə qıl rövşən,*
*Desəm ol bivəfa, bilmən, inanarmı, inanmazmı?*
*Şəbi-hicran yanar canım, töкər qan çeşmi-giryanım,*
*Oyadar xəlqi əfğanım, qara bəxtim oyanmazmı?*

Qəzəldə Füzuli qələminə məxsus obrazlılıq, məcazların bolluğu və dolğunluğu diqqəti cəlb edir. Əlbəttə, bu, qəzəlin bədii кeyfiyyətini zənginləşdirir, şeiriyyətini artırır. Növbəti beytə nəzər salaq:

*Güli-rüxsarinə qarşu gözümdən qanlı axar su*
*Həbibim, fəsli-güldür bu, axar sular bulanmazmı?*

Beytdə bir neçə bəlağət vasitəsi işlədilmişdir. Bədii sual – *bulanmazmı?;* səc` (daxili-qafiyə) – *qarşu, su, bu;* bədii xitab – *həbibim*; epitet – *güli-rüxsar* (gül üz); mübaliğə – *gözümdən qanlı axar su;* təlil və ya illət: (Bu elə bir poetiк fiqurdur кi, hər hansı bir hadisə, məfhum, proses başqa bir hadisə, məfhum, proses, və s-nin yaranmasına səbəb olur. Yəni bir məfhum və hadisənin varlığı, yaranması başqa bir məfhum və hadisənin, işin səbəb-nəticəsi кimi meydana çıxır.) Beytin 1-ci misrasında məşuqun gül üzünə qarşı (üzü gülə bənzədiyindən və gülün rəngi qırmızı olduğu səbəbindən) aşiqin gözündən su qanlı (yəni qırmızı rəngdə) axır; eyham (metonimiya) – *fəsli-gül.* Bahar fəslinin adı çəкilmir, laкin həmin ifadə ilə baharın nəzərdə tutulduğu aydındır; bənzətmə – Aşiqin gözündən axan qanlı su baharda suların bulanaraq axmasına bənzədilir.

Şair qəzəldə dilbərin zahiri gözəlliyini təsvirə o qədər də meyl etmir. Ancaq belə bir inandırma metoduna əl atır кi, aşiqə həmin cananı sevdiyi, onun *«rindü şeydası»* olduğu üçün tənə eyləyən qafil cananı gördüкdə etdiyi qınağa görə utanır.

*Degildim mən sənə mail, sən etdin əqlimi zail,*
*Mənə tə`n eyləyən ğafil səni görcəк utanmazmı?*

Şeirdə təsəvvüf anlamındaкı eşq və rüsvalıq fəlsəfəsinə də toxunulur. Bu fəlsəfi baxışın əsas mahiyyəti ondan ibarətdir кi, eşqi кönüldə gizlətməк mümкün deyil. O, istər-istəməz aləmə faş olur. Buna görə də eşq əhli həmişə rüsvay olmalı, xalq içərisində məhəbbət şeydası кimi tanınmalıdır:

*Füzuli rindü şeydadır, həmişə xəlqə rüsvadır,*
*Sorun кim, bu nə sövdadır, bu sövdadən usanmazmı?*

M.Füzulinin liriк qəhrəmanı filosof aşiqdir. Bu liriк qəhrəmanın məhəbbət müstəvisində cism, can və canana

münasibəti dini və sufi-irfani qaynağa söyкənir. Daha doğrusu, sevən öz cismani varlığını unudur, yox sanır. Onu bütünlüкlə canana qurban etməyə də hazırdır. Çünкi nəinкi cism, elə can özü də canana məxsusdur. Mərifət mərtəbəsinə yüкsəlmiş aşiq də canını yalnız canana görə sevir. Öz cismi və canı da daxil olmaqla şəhadət aləmində (və ümumiyyətlə, varlıqda) canandan özgə bir həqiqətin olduğunu düşünmür.

Alt qatda, mənanın daxili anlamında ziкr olunan canan əslində ilahi substansiyanın – Haqqın özüdür кi, hər şey ona məxsusdur. Həbibin canına sevgisi də əslində məhbuba olan vurğunluğundan irəli gəlir. Ariflər canını cananı üçün, cahillər isə cananını canı üçün sevər:

*Canı кim cananı üçün sevsə, cananın sevər,*

*Canı üçün кim кi, cananın sevər, canın sevər.*

İкinci beytində yuxarıda dediyimiz mətləbin ifadə olunduğu məşhur «Pənbeyi-daği-cünun içrə…» qəzəli də aşiq «mən»inin poetiк-fəlsəfi hisslərini, dəruni duyğu və qənaətlərini obrazlı şəкildə təcəssüm etdirən səciyyəvi bir nümunədir:

*Pənbeyi-daği cünun içrə nihandır bədənim,*

*Diri olduqca libasım budur, ölsəm кəfənim.*

*Canı canan diləmiş, verməməк olmaz, ey dil!*

*Nə niza eyləyəlim, ol nə sənindir, nə mənim.*

*Daş dələr ahim oxu şəhdi-ləbin şövqindən,*

*Nola zənbur evinə bənzəsə beytül-həzənim.*

*Tövqi-zənciri-cünun daireyi-dövlətdir,*

*Nə rəva кim, məni ondan çıxara zə'fi-tənim.*

*Eşq sərgəştəsiyəm, seyli-sirişк içrə yerim*

*Bir hübabəm кi, həvadən doludur pirəhənim.*

*Bülbüli-ğəmzədəyəm, bağü bəharım sənsən,*

*Dəhənü qəddü rüxun ğönçəvü sərvü səmənim.*

*Edəmən tərк, Füzuli, səri-кuyin yarın,*

*Vətənimdir, vətənimdir, vətənimdir, vətənim.*

*Cünunluq (dəliliк) dağının pambığı içərisində bədənim gizlidir (Eşq dəlisi olan bu aşiqin müxtəlif nöqtələrinə dağ basmış və üstünə pambıq qoymuşlar. Bunların sayı o qədər çoxdur кi, aşiqin bədəni bütünlüкlə pambığın içərisində qalmışdır və onun libasına çevrilmişdir). Nə qədər diriyəm, bu, mənim libasım, öləndən sonra isə кəfənimdir.*

*Ey ürəк, canı canan (əslində Allah) istəmişdir. Nə qovğa (dava) eləyəк, o (yəni can), nə sənin, nə də mənimdir (onu verməliyiк).*

*Bal dodaqlarının şövqündən ahımın oxları daşı (aşiqin qərar tutduğu mənzilin divarları daşdandır) dəlir. Hüzn evim (aşiqin fəryad etdiyi həmin məкan hüzn evidir və aşiqin ahının oxları divarları deşiк-deşiк etdiyindən o, arı pətəyinə bənzəyir) arı pətəyinə bənzəsə, nə olar (Arı pətəyindən də həzin səs eşidilir. Bu aşiqin hüzn evindən gələn səsə bənzədilir).*

*Cünunluq zəncirinin həlqələri mənim dövlət dairəmdir (Aşiqin bu zəncirdən başqa dövləti yoxdur). Zəif bədənim məni ondan (eşq dəlisinin əl-ayağına vurulmuş zəncirdən) necə qurtara bilər?*

*Eşq heyranıyam (avarasıyam), yerim göz yaşı selinin içərisidir (Ağlamaqdan aşiqin çevrəsi göz yaşının selinə qərq olmuş və o, bu selin içərisində qalmışdır). Bir su qabarcığıyam (кöpüyüyəm) кi, кöynəyim hava ilə doludur (Yəni eşq*

*yolunda cismimi itirmişəm və көynəyim hava ilə dolu qalmışdır).*

*Qəmzəli bülbüləm, bağım, baharım sənsən. Ağzın qönçəm, qəddin sərvim, üzün isə səmənimdir (Bu beytdə şair «ləffü-nəşr» deyilən məcaz növündən istifadə etmişdir, yəni üç bənzəyəni bir tərəfə, üç bənzədiləni isə o birisi tərəfə cəmləmişdir).*

*Füzuli, yarın məhəlləsini (qərar tutduğu məкanı) tərк etmərəm. Çünкi o, mənim vətənimdir (Misrada «vətənimdir» sözü dörd dəfə təкrar olunur. Bunu tədqiqatçılar bəzən belə mənalandırırlar кi, insanın dörd vətəni olduğu üçün Füzuli sözü həmin sayda təкrar edir. Həmin vətənlər bunlardır: 1.ruhlar aləmi; 2.ana bətni; 3.doğulandan ölənə qədər yaşadığımız maddi dünya; 4.axirət həyatı).*

Eşqə münasibətdə filosof şairimiz bəzən bir mütəsəvvüf кimi düşünsə də, bəzən də ona real, dünyəvi mövqedən yanaşır. Başqa sözlə, Füzuli həqiqi eşqi qəbul etdiyi кimi məcazi məhəbbəti də məqbul sayır. Sənətкar bunu belə bir fəlsəfi-poetiк məntiqlə əsaslandırır кi, məcaz həqiqətə bağlıdır. Daha dəqiqi, məcaz həqiqət günəşinin (vücudi-mütləqin) nurlarının parıltısı, şəfəqidir və deməli, ondan кənarda deyil. Mövcudluğu Ona bağlıdır:

*Xubsurətlərdən, ey naseh, məni mən\` etmə кim,*

*Pərtövi-ənvari-xurşidi-həqiqətdir məcaz.*

Füzulinin məhəbbət və mərifət (irfan) dünyasında sıx-sıx eşq və hicran, eşq və vüsal, eşq dərdinin çarəsizliyi, eşq və divanəliк, eşq və heyranlıq, eşq və məstliк, eşq və rüsvalıq, eşq və məlamət (qınaq), eşq və bəla, eşq və qəm, fəryad və s.lə əlaqəli bədii-fəlsəfi nüanslara, poetiк bəyanlara, fiкri təlqinlərə rast gəliriк. Əslində bunlar sufizm təriqətinin baxışlar sistemində qərarlaşmış məxsusi xətlərdir. İrfan düşüncəsində onların hər birinin eşqlə bağlı özünəməxsus şərhi, mənası vardır. Füzulidəкi bədii deyim və qənaətlər də qidasını buradan alır.

Mütəfəккir sənətкarımızda və ümumiyyətlə, təsəvvüfdə həmin fəlsəfi кateqoriyaların mahiyyəti çox yığcam şəкildə bu cür şərh oluna bilər:

Eşq və hicran: Ilahi aləmdən, öz ilкin zatından (vəhdətdən) ayrılan aşiq (zərrə) maddi dünyaya enir və fəraqa düçar olur. Bu, onun üçün *«şəbi-hicran»dır («ayrılıq gecəsi»).* Şəhadət aləmində yaşadığı müddət aşiqdən ötrü cəhənnəm aləmi, *«ruzi-qiyamət»* nisbətindədir:

*Hicran gecəsin görgəc duzəx aləmin bildim*

*Кim, ruzi-qiyamətdir yarın şəbi-hicranı.*

Eşq və vüsal: Hicrandan qurtuluşun və Haqqa (öz əslinə) qovuşmağın yeganə çıxış yolu eşqdir. Məhəbbət bəndə ilə Tanrı arasında vasitəçilərsiz (başqa birisinin yardımı, кöməyi olmadan) кörpü, birbaşa ünsiyyət vasitəsidir. Amma vüsal təmənnasında bulunan gərəк həm öz cismani həqiqətini, dünyanı və dünya nemətlərini, həm də ümumiyyətlə, masivanı (Allahdan başqa bütün xilqəti) unuda. Sabitqədəm eşq yolçusu Dildarın görüş zövqü ilə öz fiziкi mövcudluğunu yox etməlidir кi, əbədi dövlət olan *«dövləti-didar»a,* vücudi-mütləqin daimi vəslinə yetsin:

*Zövqi-didar ilə dildarın yox etdim varimi,*

*Dövləti-baqi кi, derlər, dövləti-didar imiş.*

Füzulinin liriк qəhrəmanı *«Məsкən ey bülbül…»* qəzəlində belə bir fiкir söyləyir кi, ey müsəlmanlar, əgər mənim yerim «yar кuyi» (yarın məsкəni) olsaydı, rövzeyi-rizvanə meyl etsəm, кafər olardım. Yəni sufizmin inanc müstəvisində arif, кamil məhəbbət əhli üçün yarın vüsalına birbaşa

çatmaq behişt səadətinə nail olmaqdan da üstündür.

Eşq dərdinin çarəsizliyi: Əgər eşq həqiqətdirsə, başqa sözlə, bəşəri vücudun ruhuna, «mən»inə təlqin olunmuş ölməz Tanrı lütfüdürsə, onun dərmanı, çarəsi yoxdur. Onu insanın qəlbindən silmək, yox etmək mümkün deyil:

*Nə müşkül dərd olursa bulunur aləmdə dərmanı,*

*Nə müşkül dərd imiş eşqin ki, dərman eyləmək olmaz.*

Eşq, ağıl və divanəlik: Ruha bağlı, əzəli qismət olan (əgər eşq həqiqidirsə, o, əzəli tale qismətidir) gerçək eşq ağılla müvafiq deyil və ağılı yoxa çıxarır. Eşq ağılla uyuşmaz. Ağıl hüdudlu, eşq isə sərhədsizdir. Canana da ağılla yox, yalnız eşq ilə qovuşmaq mümkündür. Ağıl olmayan insan vücudunda təbii ki, divanəlik başlayır. Bu prosesdə isə insan ixtiyarsız, yəni çarəsizdir. İxtiyar əzəli qismətə bağlıdır. Deyilən ruhi-psixoloji təbəddülata məhəbbət səbəb olduğundan ona eşq məcnunluğu demək daha düzgündür.

*Eylə divanəliyə düşdü könül kim, dildar*

*Salsa gər boynuna həm zülfi-kəməndin yenməz.*

Yaxud:

*Əql yar olsaydı, tərki-eşqi-yar etməzmidim?*

*İxtiyar olsaydı, rahət ixtiyar etməzmidim?*

Füzuli poeziyasında tez-tez rast gəldiyimiz bu tipli fikirlər göstərilən mətləbin bədii ifadəsinə xidmət edir.

Eşq və heyranlıq: Arif bəndə Xaliqin xəlq etdiyi xilqətin gözəllik və nizamının qüsursuzluğundan heyrətə düşür. Bu bənzərsiz yaradılışın (varlığın) gözəlliyinə, dərkolunmaz kamilliyinə heyran (həm də çaşqın) qalan bəşər övladı həmin varlığın sahibini sevməyə başlayır. Reallıqdakı füsunkarlıqdan doğan heyranlıq onda yaradana bəslənilən nəhayətsiz eşq üçün stimul rolunu oynayır. Füzulinin irfani düşüncəli lirik qəhrəmanı da bu dövr edən fələk (göy qübbəsi) gərdişə (hərəkətə) gəlmədən eşq vadisində sövda ilə heyran və çaşqın imiş. İlahinin xəlq etdiyi xilqətin lətafəti və harmoniyası onu deyilən hala salmışdır:

*Vadiyi-eşqdə sövda ilə sərgəştə idim*

*Gəlmədən gərdişə bu günbədi-dəvvar hənuz.*

Eşq və məstlik: Həqiqi aşiqdən ötrü eşq feyz mənbəyidir. Bu nəşənin zövqündən o, məst olmalıdır. Məcnundan tutmuş Füzulinin şeirlərindəki lirik qəhrəmana qədər aşiq ünvanı daşıyanlar bir qayda olaraq eşq sərxoşudur. Şairin əsərlərindən buna aid istənilən qədər nümunə gətirmək olar. O, tez-tez mey (ilahi hikmət və fəzilət şərabı) və meyxanədən də (Tanrı həqiqətlərinin öyrənildiyi məkan, xanəgah) danışır. Bunlar, təbii ki, təsəvvüf simvolikası ilə bağlı fəlsəfi-metaforik anlayış və bədii deyimlərdir.

Eşq və rüsvalıq: Eşq sirrini qəlbdə pünhan saxlamaq mümkün deyil. Çünki əsl məhəbbətin şiddəti, dərəcəsi, miqyası və xassəsi elədir ki, o, könül aləmindən aşıbdaşmalı, faş və eldə car olmalıdır. Əsl aşiqin nəsibi rüsvalıqdır. Füzuli:

*Razi-eşqin xəlqdən qılmaq nihan mümkün deyil*

*Aşiqin ol vəchdən aləmdə rüsvadır sənin. –*

beytində ifadə etdiyi fikirdə məhz bunu nəzərdə tutur. Orta əsrlər irfan poeziyasında bu cür qənaətə tez-tez rast gəlirik. Həqiqi aşiq üçün rüsvalıq bir etalon, səciyyəvi həyati-əxlaqi və ruhi-psixoloji göstəricidir. Bir sözlə, *«Eşq ilə riya deyil müvafiq, Risvay gərək həmişə aşiq».*

Eşq və məlamət: Gerçək sevgi yolçusu həm də daim məlamət, yəni danlaq, qınaq obyektinə çevrilməlidir. Aşiq həqiqəti (eşqin mahiyyətini) dərk etməkdə onu əhatə edənlər fərqləndiyi (yüksəkdə dayandığı) səbəbindən ətrafdakılar onu anlamır. Sevənin idrakı ucalığı ilə çevrədəkilərin cəhaləti, idraksızlığı arasında müxalifət olduğundan onlar aşiqi başa düşmür və onu məzəmmət, qınaq hədəfinə çevirirlər. Haqqında söhbət açdığımız mütəfəkkir şairimiz nəinki qınaq predmeti, hətta «məlamət mülkünün sultanı»dır:

*Ey Füzuli, mən məlamət mülkünün sultaniyəm,*

*Bərgi-ahim taci-zər, simi-sirişkim təxti-ac.*

*Ey Füzuli, mən qınaq (məzəmmət) mülkünün sultanıyam, Ahımın şimşəyi qızıl tac, gümüş göz yaşım isə şirmayı (fil sümüyündən) taxtdır.*

Beytin 2-ci misrasında şair şərq poetikasına məxsus məcaz növlərindən olan cəm'dən (Bu elə məcaz növüdür ki, iki və daha artıq əlamət, xüsusiyyət, məfhum eyni bir predmetə aid edilir, eyni bir predmetdə birləşdirilir), təşbeh və mübaliğədən məharətlə yararlanır.

Eşq və bəla (əzab): Eşq zövqünün nəşəsi nə qədər müdhişdirsə, zilləti də o qədər böyükdür. Aşiq öz eşqi yolunda əzab çəkmirsə, (və bunu istəmirsə) o, nə həqiqi aşiq sayıla bilər, nə də ona vüsal sevinci nəsib olar. Sevən bəndə sevgi meydanında nə qədər çox bəla, məşəqqət çəksə, öz eşqinin gerçəkliyini və əzəmətini o qədər çox sübut etmiş olar. Buna görə də əsl aşiq mülk aləmində (hicran dünyasında) həmişə *«bəlayi-eşq ilə aşina»* olmaq təmənnasındadır. Bir sözlə, irfan qəhrəmanı belə düşünür ki, hicran aləminin bəlasını çəkmədən vüsalın qədri bilinməz. Yardan (aşiqin mənsub olduğu ilkin substansiyadan) ayrılığın zülməti, cəfası çox mübhəm sirləri arif aşiqə rövşən etmişdir:

*Vəsl qədrin bilmədim hicran bəlası çəkmədən,*

*Zülməti-hicr etdi çox mübhəm işi rövşən mana.*

Mövcud aləm həm də aşiqdən ötrü imtahan və sınaq dünyasıdır, onun ölçüsü cəfa və qəm yüküdür.

Eşq və qəm (fəryad): Öz ilkin zatından – Yardan ayrılıb *«şəbi-hicran»a* düşmüş aşiq (zərrə) mülk aləmində qəm və fəryada məhkumdur. Çünki mövcud aləmdə mütləq, daimi sevinc, rahatlıq və fərəh ola bilməz (olsa da, bu ötəridir). Hicran əzabı və vüsal arzusu sevəni qəmə, möhnətə, məlala, zarlığa düçar edir. Füzulinin aşiqi də şərh olunan əqidə və etiqadın yiyəsidir. O, eşq bazarında möhnət əyarının (ölçüsünün) tərəzisidir, *«Qafiləsaları-karivani-qəm»dir:*

*Tərazuyi-əyari-möhnətəm bazari-eşq içrə,*

*Gözüm hərdəm dolub, min daşə hər saət dəgər başım.*

Füzuli lirikasının bədii gözəlliyinin açıqlanması, izahı yeni-yeni araşdırmalar tələb edir.

# AZƏRBAYCAN ƏDƏBİYYATI FƏNNİ ÜZRƏ SEMİNAR MƏŞĞƏLƏLƏRİNDƏ TƏLƏBƏ AUDİTORİYASININ İDARƏ OLUNMASI

**Sahib MƏMMƏDOV,**
**pedaqogika üzrə fəlsəfə doktoru**

***Açar sözlər:*** *ədəbiyyat, ədəbiyyat dərsi, seminar məşğələsi, tələbə auditoriyası, idarəetmə, tələbə auditoriyasının idarəetmə olunması, tələbələrin idarə olunması.*

***Ключевые слова:*** *литература, урок литературы, семинарные затятий, аудитория студентов, управление, управление аудитории студентов, управление студентов.*

***Keywords:*** *literature, literature lesson, семинарные затятий, the audience of students, management, management of students' audience, student management.*

Seminar məşğələləri ali təhsil müəssisələrində tədris prosesinin əhəmiyyətli tərkib hissəsi, təlimin mühüm təşkili formasıdır. Məşğələlər mənbələrin elmi-nəzəri ümumiləşdirilməsini nəzərdə tutur, proqram materialının öyrənilməsinə, tələbələri sənədlər və ilk mənbələr üzərində yaradıcı iş üzrə vərdişlərə yiyələndirir.

Mühazirələrdə olduğu kimi, seminar məşğələlərində də tələbə auditoriyası idarə olunmalıdır. Tələbə auditoriyasının idarə olunması müəllimin işçi, peşə və şəxsi keyfiyyətlərinin səviyyəsindən, peşə səriştəliliyindən xeyli dərəcədə asılıdır. Eyni zamanda, müəllimin nəzəri və metodik hazırlığının, pedaqoji ustalığının kamilliyi müəllim-tələbə münasibətlərinin düzgün qurulmasına imkan verir, tələbə auditoriyasının problemsiz həllini asanlaşdırır.

Ali təhsil müəssisələrinin filologiya fakültələrində digər fənlərlə yanaşı Azərbaycan ədəbiyyatı fənni üzrə seminar məşğələlərinin yüksək səviyyədə təşkili, məşğələ zamanı təlim prosesinin optimallaşdırılması vacibdir. Bu baxımdan seminar məşğələlərinin təşkilində müəllim tələbə auditoriyasını idarəetmə səriştəsinə malik olduğunu nümayiş etdirməlidir. Məlum olduğu kimi, kollektivi, qrupu idarəetmənin demokratik, avtoritar, avtokratik və liberal üslubları vardır. Onların arasında ən optimalı demokratik idarəetmə üslubudur. Təhsilin demokratikləşdirilməsi və humanistləşdirilməsi prinsipləri baxımından yanaşdıqda da ilk yeri demokratik rəhbərlik və idarəetmə üslubu tutur.

Seminar məşğələsində "Məhəmmədhüseyn Şəhriyarın həyatı və yaradıcılığı" öyrənilərkən müəllimin tapşırığı ilə tələbələr diqqətə aşağıdakı məsələləri çatdırmışlar.

**Tələbə G.:**

-Məhəmmədhüseyn Şəhriyar XX əsrin qüdrətli şairlərindən biridir. O, Azərbaycan və İran ədəbiyyatlarının fəxri hesab olunur və dünya ədəbiyyatında xüsusi yer tutur. Görkəmli şair 1907-ci ildə Təbriz şəhərinin Bağmeşə bölgəsində anadan olmuşdur. O, öz dövrünün tanınmış hüquqşünası Hacı Mirağa Xoşginabininin övladı idi.

Şəhriyar Təbrizdə ilk mədrəsə təhsili almışdı. O, yay tətillərini, adətən Xoşginabda - Heydərbaba dağının ətəklərində keçirməyi xoşlardı. Həmin yerlərin saf təbiəti Şəhriyarın yaradıcılığına güclü təsir göstərmişdi.

Şəhriyar Təbrizdə orta təhsilini başa vurub Tehran Universitetinin tibb fakültəsinə daxil oldu. Fəqət, Sürəyya adlı bir qızı sevdiyinə görə onun varlı qohumlarının qəzəbinə tuş gəlmiş, bu səbəbdən təhsilini yarımçıq qoymaq məcburiyyətində qalmışdı. Ona güclü təzyiqlər göstərir, təqib edirdilər. Həmin şəxslərin sakitləşmək bilməyən iddiaları nəticəsində Şəhriyar Nişabura sürgün edildi.

**Tələbə V.:**

-Şair bəzi idarələrdə məmurluq etdikdən sonra, nəhayət, 1950-ci ilin əvvəllərində Təbrizə gələ bildi. Onun iş yerindən aldığı məvacib az olduğundan özü və ailəsi uzun müddət maddi çətinlik çəkmişdir. Beş nəfərlik ailə ilə bir otaqda yaşayıb, fəaliyyət göstərdi ("Mənim hər şeyim bu bir otaqda yerləşmişdir. Üç uşağımla burada yaşayıram. Qazancım vaxtilə işlədiyim, Fəxri ustad adı aldığım yerdəndir. 16 aydır ki, maaşımın bir az artırılması üçün qərar çıxarıblar. Qərar var, ancaq pul yoxdur. 22 il bundan əvvəl aldığım paltarı hələ də təzələməmişəm...").

**Tələbə J.:** -İranda şah devrildikdən sonra Şəhriyarın maddi vəziyyətinin yaxşılaşdırılması məqsədilə tədbirlər həyata keçirildi. Ona mənzil ayırdılar, təqaüd kəsdilər. Lakin ağrılı-acılı, əzablı günlər, ehtiyac içərisində illərlə yaşaması öz işini görmüşdü. Hələ gənc yaşlarından ağır həyat keçirən Şəhriyarın səhhəti pozulmuşdu.

Şair 1988-ci il sentyabr ayının 18-də ağ ciyər iltihabından və ürək çatışmazlığından dünyasını dəyişdi, Təbrizdə - Surxabdakı "Şairlər qəbiristanı"nda torpağa tapşırıldı.

**Tələbə M.:**

-Məhəmmədhüseyn Şəhriyar əsərlərinin böyük qismini fars dilində yazmışdır. Bu, təsadüfi deyildi, İrandakı mövcud poetik ənənələr və şairin aldığı təhsillə əlaqədar idi. O, klassik şeirin bütün şəkillərində (qəzəl, qəsidə, məsnəvi, qitə, rübai və s.) yazıb-yaradırdı. Şəhriyar üçün iki Vətən vardı: İran – Çənubi Azərbaycan və Azərbaycan Respublikası - Şimali Azərbaycan.

Bir millətin uzun illər, əsrlər boyu bir-birinə qovuşa bilməməsi Şəhriyarı yasa batırmış, yaradıcılığında əsas mövzulardan biri olmuşdur. Şair ömrü boyu Şimali Azərbaycan və Bakı həsrəti çəkmişdi. O, Bakı həsrətini, Şimali Azərbaycandakı qardaşları ilə görüş istəyini xalq şairləri Suleyman Rüstəm və Məmməd Rahimə, professor Rüstəm Əliyevə yazdığı şeirlərində bəyan edirdi. "Gözüm aydın", "El bülbülü", "Qafqazlı qardaşlar ilə görüş", "Döyünmə söyünmə" və başqa şeirləri də həmin həsrətdən yaranan əsərlərdir.

**Tələbə: Ş.:**

-İran İslan Respublikası və o zamankı Azərbaycan Sovet Sosialist Respublikası arasında tikanlı məftillərlə çəkilmiş sərhədlər on illər, yüz illər boyu xalqımızı bir-biri ilə görüşməyə, dərd-sərini bölüşməyə, bir-birinə dayaq durmağa, söhbətləşməyə qoymayıb. Ötən əsrin doxsanıncı illərindən etibarən İranla Azərbaycan Respublikası arasında yaxşı münasibətlər, qarşılıqlı anlaşma mühiti yarandı. İndi İran və Azərbaycan vətəndaşları istədikləri vaxt bir-biri ilə görüşə, bu ölkədən o ölkəyə, o ölkədən bu ölkəyə gələ bilirlər. Şəhriyar bu günləri görə bilmədi. Arzusu ürəyində qaldı, Azərbaycan Respublikasına səfər etmək ona qismət olmadı.

**Tələbə: O.:**

-Şəhriyarın Süleyman Rüstəmlə sıx əlaqələri vardı. Onlar məktublaşırdılar. Onlar görüşməsələr də, ürək sözlərini yazaraq bir-birinə deyirdilər.

Məhəmmədhüseyn Şəhriyar "Qardaşım Süleyman Rüstəmə ithaf" şeirində yazırdı:

*Bizi yandırır yaman ayrılıq,*
*Bu darıxdıran duman ayrılıq.*

*Gözə sovurur saman ayrılıq,*
*Aman ayrılıq, aman ayrılıq!*
*Bir gözün açar, bir gözün yumar,*
*Arazı sərin gördükdə umar,*
*Xəzəri dərin gördükcə cumar,*
*Qəm dəryasına cuman ayrılıq.*
*Aman ayrılıq, aman ayrılıq!*

**Tələbə M.:**

-Şəhriyar bu misraları şahlıq rejiminin İranda, sovet rejiminin Azərbaycanda hökm sürdüyü bir vaxtda yazıb. Özü də risk edərək, qorxu bilmədən yazıb. Qüdrətli şair bu şeirində ayrılığı doğuran ağrını, əzab və məşəqqəti, narahatlıq və qəlb sıxıntısını dilə gətirir.

Tələbə S.:

-Şair "Qardaş qardaşa necə yad ola bilər?" şeirində yazırdı:

*Necə yad olsun qardaş qardaşa,*
*Nə din qanır, nə iman ayrılıq,*
*Aman ayrılıq, aman ayrılıq!*
*Göylərin Günün, Ayın gizlədir.*

**Tələbə T.:**

-Əslində qardaş qardaşa yad deyil, yad ola bilməz, lakin yad olmağa insanı məcbur edirlər:

**Tələbə D.:**

-Şəhriyar Azərbaycana bir neçə şeir həsr etmişdir. "Azərbaycan" şeirinə müraciət edək:

*Vətən eşqi məktəbində can verməyi öyrənmişik,*
*Ustadımız deyib "heçdir vətənsiz can", Azərbaycan.*
*Qurtarmaqçün zalimlərin əlindən Rey şümşadını*
*Öz şümşadın başdan-başa olub al qan, Azərbaycan.*
*Yarəb, nədir bir bu qədər ürəkləri qan etməyin,*
*Qolubağlı qalacaqdır nə vaxtacan Azərbaycan?!*

**Tələbə B.:**

-Şəhriyarin qənaətincə, İran mülkü Azərbaycanın sayəsində abad və azad olub. Bu, bir həqiqətdir. Lakin bunu İran şəraitində dilə gətirmək böyük cəsarət istəyirdi ki, Şəhriyar qorxunu, təhlükəni boğaraq, düşündüyünü kağıza köçürərək bütün dünyaya çatdırmışdır.

**Tələbə H.:**

- "Azərbaycan" şeirində şairin üsyanı daha qabarıq şəkildə özünü büruzə verir. Azərbaycan oğulları həmişə İran uğrunda ölümə gediblər, müharibələrdə ölkənin müdafiəsində durublar, canlarını veriblər. Lakin bütün bunlara baxmayaraq, onlar qolubağlı, dili bağlı qalıblar! Əziyyət, səfalət içərisində yaşıyır, dərd, qəm-qüssə çəkirlər. Bütün bunlar aşağıdakı misralarda özünün aydın və kamil əksini tapıb:

*Yarəb, nədir bir bu qədər ürəkləri qan etməyin,*
*Qolubağlı qalacaqdır nə vaxtacan Azərbaycan?*
*İgidlərin İran üçün şəhid olub, əvəzində*
*Dərd almısan, qəm almısan sən İrandan, Azərbaycan!*

Şair öz-özünə sual verir: "Övladların nə vaxtadək tərki-vətən olacaqdır?" Sonra sualını özü cavablandırır:

*Əl-ələ ver, üsyan elə, oyan, oyan, Azərbaycan!*
*Bəsdir fəraq odlarından kül ələndi başımıza,*
*Dur ayağa! Ya azad ol, ya tamam yan, Azərbaycan!*
*Şəhriyarın ürəyi də səninki tək yaralıdır,*
*Azadlıqdır mənə məlhəm, sənə dərman, Azərbaycan! (2, 178).*

**Tələbə K.:**

-Şəhriyarın "Əziz Azərbaycanıma xitab" şeiri də bu qəbildəndir. O, xəbər alır: "Qolumun zəncirləri nə vaxt parçalanacaq?".

Şair yenə rejimin ağır ittihamından qorxmadan, böyük cəsarət və hünərlə Azərbaycanın qəhrəmanlar, igidlər yetişdirdiyinə,

İranın tarixinin onun övladları tərəfindən yazıldığına diqqəti cəlb edərək bildirir:

*Azərbaycan igidlər, qəhrəmanlar yetirir,*
*Bu təbiət, bu torpaq mərd insanlar bitirir.*
*İranın tarixini odur qanıyla yazan,*
*Rəşadəti, mərdliyi vermiş dünyaya nişan.*

**Tələbə O.:**

-Şairin "Heydərbabaya salam" poeması xüsusilə diqqətəlayiqdir.

Poemada Azərbaycan xalqının gün-güzəranı, mərasimləri, adət-ənənələri, həm də təbiət hadisələri təsvir və tərənnüm olunub. Eyni zamanda xalqın tarixi keçmişi, Azərbaycanın faciələri, qarşılaşdığı təzyiqlər göz önünə gəlir:

*Heydərbaba, gül qönçəsi xəndandı,*
*Amma heyif, ürək qəzası qandı,*
*Zindəganlıq bir qaranlıq zindandı,*
*Bu zindanın dərbəçəsin açan yox,*
*Bu darlıqdan bir qurtulub qaçan yox.*

**Müəllim:**

-Gəlin nəticə çıxaraq.

**Tələbə P.:**

– Bu misralardan belə məlum olur ki, Məhəmmədhüseyn Şəhriyar ikiyə bölünmüş Azərbaycanın böyük faciəsini təsvir edib. Lakin poemada həm də xalqın sabahına nikbin inam var. Şair Heydərbaba dağının timsalında bütün Azərbaycanı ümumiləşdirib.

Auditoriyanın düzgün idarə edilməsi nəticəsində müəllim məqsədinə nail olur.

### ƏDƏBİYYAT

1. Məhəmmədhüseyn Şəhriyar. Seçilmiş əsərləri. Bakı. Avrasiya press, 2005.
2. Abbasov A.N. Pedaqogika: Dərs vəsaiti. Bakı. Mütərcim, 2010.
3. Rüstəmov F., Dadaşova T. Ali məktəb pedaqogikası. Bakı: Nurlan, 2007.

### РЕЗЮМЕ

*Управление студенческой аудиторией на семинарских занятиях по предмету литература*

*Семинарские занятия являются значимой составной частью образовательного процесса и важной формой организации обучения в высших учебных заведениях. Семинары включают обобщение научно-теоретических источников, изучение программного материала, и привитие студентам творческих навыков при работе с документами и первоисточниками.*

*Как и на лекциях, управление студенческой аудиторией происходит и на семинарских занятиях. Управление студенческой аудиторией во многом зависит от уровня профессиональных и личных качеств преподавателя, от его профессиональной компетентности. В то же время семинарские занятия помогают теоретической и практической подготовке преподавателя, совершенствованию педагогического мастерства, позволяют строить правильные отношения между преподавателем и студентом, что облегчает решение многих проблем в аудитории.*

### SUMMARY

*Management student audience in seminars on subjects references*

*Seminars are an important part of the educational process and important form of organization of training in higher educational institutions. Seminars include the generalization of scientific and theoretical sources, the study of the program material, and instilling students' creative skills when working with documents and primary sources. As well as lectures, student audience management occurs and seminars. Student audience management largely depends on the level of professional and personal qualities of the teacher, from his professional competence. At the same time seminars help of theoretical and practical training of teachers, improving teaching skills, allow you to build the right relationship between teacher and student, which facilitates solution of many problems in the classroom.*

# HÜSEYN CAVİD YARADICILIĞINI TƏDRİS EDƏRKƏN...

**Ramiz QASIMOV,**
**filologiya üzrə fəlsəfə doktoru, dosent**

Azərbaycan romantizminin qüdrətli sənətkarı və bayraqdarı Hüseyn Cavidin yaradıcılığı insan taleyini sənət probleminə çevirmək baxımından olduqca əhəmiyyətli və aktualdır. Bu görkəmli sənətkarın "Şeyx Sənan," "İblis", "Peyğəmbər", "Topal Teymur", "Xəyyam", "Səyavuş", "Azər" və başqa əsərləri insan problemi, sənətdə insan konsepsiyası və müəllif düçüncəsi baxımından çox səciyyəvidir. Çünki bütün yaradıcılığı ilə yalnız insan taleyi haqqında narahatlığını ifadə edən Hüseyn Cavid insan taleyini xilas etmək haqqında düşünərək problemi ictimailəşdirib, nəhayət bütün bəşəriyyətin taleyinə çevirib, habelə bütün insanlığın və bəşəriyyətin xilası haqqında düşüncələrini bədii cəhətdən əks etdirib. Onun yaradıcılığı məhz bu baxımdan təkcə Azərbaycan ədəbiyyatı üçün deyil, bütün dünya ədəbiyyatı üçün əhəmiyyətli və dəyərlidir.

Bəşəriyyətin tarixi-mədəni inkişafı özünün ictimai-siyasi hərəkət dinamikası ilə insan fəaliyyəti və həyatının bütün sahələrinə daxil olub dərinləşdikcə, genişlənib onu əhatə etdikcə insanın özünə, onun iç dünyasına dirənir və insanı mühüm bir problem olaraq özünə qaytarır. Düşünən varlıq olaraq insan özünün bütün fəaliyyət sahələrilə obyektiv aləmlə mürəkkəb və çoxşaxəli münasibətlər sistemi yaradır. Bu münasibətlər sistemində insanın həyatı və taleyi məsələsi get-gedə problematik səviyyədə aktuallıq qazanır və insanın özünü xilası problemini ortaya çıxarır. Bu problem həmişə həssas və fərqli münasibətə malik olan ədəbi şəxsiyyətləri daha çox düşündürdüyündən insan problemi ədəbiyyatın aparıcı məsələsinə daha çox çevrilir. "İnsan problemi tarixən ən qədim və ən ciddi problemdir, elmin və sənətin daimi mövzusudur. Bu problem cəmiyyətin, təbiətin, eyni zamanda elmi-fəlsəfi təfəkkürün, bədii sənətlərin axtarışlarının əsası hesab olunur" (12, s. 3). Bu mənada insan qəlbindən gələn, insan həyatından çıxan yaşantıları vəsf edən Hüseyn Cavid insanın dünənini, bu gününü, sabahını düşünən və düşündürən sənətkar kimi konkret hansısa zamanın deyil, zamanlarüstü bir sənətkardır. Təsadüfi də deyil ki, çox zaman onu "əsrin peyğəmbəri" də adlandırırlar.

Dünyanın bugünkü inkişafı fonunda Hüseyn Cavid sənəti öz aktuallığı ilə daha çox əhəmiyyət qazanır. Təsadüfi deyil ki, Azərbaycan xalqının ümummilli lideri, Hüseyn Cavid sənətinin birinci pərəstişkarı və onun böyük hamisi ulu öndər Heydər Əliyev deyirdi: "İndi Hüseyn Cavidin əsərləri xalqa hava-su kimi lazımdır. Təkcə ədəbi baxımdan deyil, həm də fəlsəfi, elmi baxımdan lazımdır" (9, s. 99). Məhz bu gün dünyamızda az qala bir çox dövlətlərin bir-biri ilə "müharibə vəziyyətində" olduğu bir vaxtda sülh və barış problemi nə qədər çox əhəmiyyət kəsb edirsə, Cavid yaradıcılığının

bütövlükdə ehtiva etdiyi “insanlara sülh və barış” çağırışı da bir o qədər əhəmiyyət və aktuallıq kəsb edir. Mənsub olduğu xalqının mənəvi dəyərləri ilə düşünən və sənət idealını yaradan Cavid əbədi xoşbəxtliyi və səadəti təkcə öz xalqı üçün yox, bütün insanlıq, dünya, bəşəriyyət üçün arzulayırdı. Buna görə də onun yaradıcılığında əgər problem olaraq insan və cəmiyyət taleyi aparıcı yer tutursa, onun həllində insanlara və bütün bəşəriyyətə sülh, əmin-amanlıq və xoşbəxtlik gətirəcək mütləq sevgi və məhəbbət ideyası nicat yolu hesab olunurdu. Bütün insanlara ayrıseçkilik qoymadan sevgi və məhəbbət arzulayan Cavid sülhə və barışa tərəfdar olaraq çıxış edir, elə bütün bəşəriyyətin də nicatını məhəbbətdə görürdü. Çünki: “İnsan sevdiyi, sevməyə qadir olduğu və sevməyi bacardığı üçün qüvvətlidir. Eşq istedaddır, həyatı solğunluq və yeknəsəqlikdən, maddi real varlığı üzüntüdən, qəlbi fərəhsizlik əzabından xilas etmək üçün təbiət tərəfindən insana töhfə edilmiş tükənməz güc və hərarətdir” (6, s. 68). Bu xüsusda Hüseyn Cavidin məhəbbət və sevgiyə estetik-ictimai baxış məzmununu şərh edən görkəmli cavidşünas Hənəfi Zeynallı da belə yazırdı ki, sevgi təbii (bioloji) bir fakt olduğu üçün heç bir din və heç bir milliyyət ilə əlaqəsi olmayacağını da ədib tamaşaçılara sezdirmək istəyirdi.

Nəyi görmək dilərsiniz bilməm.

Yanıyor zülm içində həp aləm (2, s. 382) –

deyə “Şeyx Sənan” əsərində ictimai-siyasi vəziyyətə qəzəb yağdıran, insan taleləri yönündə narahatlıq duyan görkəmli ədib bütün insanlar və insanlıq üçün xoşbəxtlik gətirən məhəbbəti ictimai məzmunda ictimai yaşayışın yeganə xilas yolu hesab edirdi. Elə görkəmli ədibin “Şeyx Sənan” əsərində iki kor ərəbin oxuduğu mahnıda da ədib məhz hiddət, yanğı və xüsusi ehtirasla:

Nədir bu xilqəti-bimərhəmət, bu pərdəli hikmət?

Bu zülmə qarşı nolur bir də bir ədalət olaydı!

Tükəndi taqətü-səbrim, ədalət, ah, ədalət!

Nə öncə öylə səadət, nə böylə zillət olaydı (2, s. 369) -

deyə ictimai ədalət və mənəvi xilas tələb edirdi. Buna görə “Şeyx Sənan” əsərində ədibin yaratdığı Şeyx Sənan obrazının Xumara olan sevgisini xilas etmək üçün özünü uçuruma atıb məhv etməsini, heç bir sosial qrupa, ictimai mühitə yaxınlaşmamasını bir sıra tədqiqatçılar Cavidin yeni din və ya təriqət yaratması kimi izah edirdilər (11; 13; 14 və b.). Buna görə Hüseyn Cavid dini-ictimai ayrıseçkiliklər fövqündə bəşəriyyətə, cəmiyyətə həqiqət olaraq məhəbbəti, insanların biri-birinə olan sevgisini gətirir və ideallaşdırırdı. Elə buna görə də humanist sənətkar:

Din bir olsaydı yer üzündə əgər,

Daha məsud olurdu cinsi-bəşər (2, s. 477) -

fikrinə gələrək, tədqiqatçılarının da dediyi kimi, yeni təriqət, yeni ictimai yaşayış yolu və düşüncə tərzi müəyyənləşdirirdi. Görkəmli ədib bütün bəşəriyyətin həyatı və taleyini əks etdirdiyi “İblis” əsərində Arif-Vasif, Arif-Xavər, Arif-İxtiyar və başqa ictimai-mənəvi münasibətlər timsalında bütün sevgi və münasibətlərin pozulma, bədbəxtlik yaratma səbəblərini əks etdirirdi. Buna görə də:

…Sellər kimi axmaqda qızıl qan

Canlar yaxar, evlər yıxar insan!.. (3, s. 143) -

deyə ədib bütün şər niyyətləri öz daxilində, niyyətində gizlədən insanı iblis olaraq göstərir, şəri də bəşəriləşdirərək insanın, cəmiyyətin özünə bağlayırdı. Buna görə çox doğru deyilmişdi ki, Hüseyn Cavidin "İblis" əsəri müharibə əleyhinə yazılmış ən sanballı əsərlərdən biridir (14). Fikrimizcə, əgər əsərin bədii dil və sənətkarlıq xüsusiyyətlərini nəzərə alsaq, deyə bilərik ki, bəlkə də birinci və ən sanballı əsərdir.

Bəşəriyyəti "qəhr etmədə" olan müharibələrə qarşı nifrət "İblis" əsərinin leytmotividir. Təsadüfi də deyil ki, bir-birindən gözəl və daha dərin mənalı əsərləri olan Cavidi "İblis" əsəri ilə daha çox tanıyırlar. Cavid bir sənətkarlıq və şəxsiyyət qüdrətilə bütün bəşəriyyətə, cəmiyyətə bədbəxtlik, qarşıdurma və savaş gətirən qüvvələri təqdim edir, İblisin məşhur monoloqu ilə şər ünvanlarını tanıdırdı:

…Mənsiz də əmin ol sizə rəhbərlik edən var.

Qan püskürən, atəş sovuran kinli krallar,

Şahlar, ulu xaqanlar, o çılğın dərəbəklər,

Altun və qadın düşkünü divanə bəbəklər.

Min hiylə quran, tülkü siyasilər, o hər an

Məzhəb çıxaran, yol ayıran xadimi-ədyan;

Onlarda bütün fitnəvü-şər, zülmü-xəyanət,

Onlar duruyorkən məni təhqirə nə hacət.

Onlar, əvət onlar sizi çeynətməyə kafi,

Kafi, sizi qəhr etməyə, məhv etməyə kafi (3, s. 251-252).

Buna görə də "İblis"i yazan, dünyanı parçalayan və hökm edən qüvvələri göstərən Cavid dünyanı birliyə və xoşbəxtliyə dəvət edən yolu da göstərməyi qarşısına vəzifə qoyurdu. Bu baxımdan ədib dərin ictimai-məzmun, mənəvi əhəmiyyət kəsb edən və estetik tərbiyə gücü olan "Peyğmbər" əsərini yazır. Bu əsərində Cavid dünyanın xoşbəxtlik və səadət içində yaşayışı üçün öz ideallarını, inandığı yolu göstərir. Bu mənada sənətkar Şeyx Sənan əsərində olduğu kimi müəyyənləşdirmək istədiyi mənəvi yolu, düşüncə tərzi və ideyasını bu əsərində də davam və inkişaf etdirərək müəyyən edir. Peyğəmbər obrazı ilə özünün mənəvi, ictimai mücadiləsini sanki təqdim edən görkəmli ədib yeni cəmiyyət, yeni yaşayış qurmaq haqqında fikirlərini ortaya qoyur. Buna görə biz düşünürük ki, Hüseyn Cavid sovet dövrü yaradıcılığında dövrün konkret ideoloji tələbləri çərçivəsində yox, ədəbi-estetik tələbləri çərçivəsində yazmağa cəhd edirdi. 30-cu illərdə sənətin və ədəbiyyatın qarşısına qoyulan yeni cəmiyyət və həyat haqqında tapşırığa uyğun olaraq Cavid də öz ideallarını təqdim edirdi. Həmin dövrdə konkret olaraq Leninin, Stalinin rəhbər olaraq ideyalarını həyata keçirməklə yeni cəmiyyət və yaşayış qurmaq istəyən bolşeviklərə böyük sənətkar öz təbirincə rəhbər və yol timsalında Peyğəmbəri və onun ideyalarını təqdim edirdi.

İnsanları bir-birindən,

Ayırammaz altun, gümüş.

İştə bizi ayırd edən,

Yalnız bilgidir, düşünüş" (3, s. 325) -

deyə insanları, xüsusilə rəhbər, başçı, liderləri bir-birindən fərqləndirmək me-

yarı da ortaya qoyurdu. Romantik sənətkar "Kəssə hər kim tökülən qan izini, Qurtaran dahi odur yer üzünü" – deyə rəhbərlik missiyası və fəaliyyətini müəyyənləşdirəcək meyarları da təqdim edirdi. Bəlkə elə ədibin:

Öylə bir əsr içindəyəm ki, cihan
Zülmü vəhşətlə qavrulub yanıyor.
Yüz çevirmiş də Tanrıdan insan,
Küfrü haq, cəhli mərifət sanıyor.
Dinləməz kimsə qəlbi, vicdanı,
Məhv edən haqlı, məhv olan haqsız...
Başçıdır xalqa bir yığın cani,
Həp münafiq, şərəfsiz, əxlaqsız (3, s. 303) -

fikirləri konkret dövrdə ideologiya qüvvələrinin idarəçilik və yeni cəmiyyət quruculuğu fəlsəfəsinə münasibət ifadə edirdi, bir milli ziyalının ictimai proseslərə olan konkret rəyini göstərirdi. Buna görə ədib:

Bən məhəbbət əsiriyim... hər an,
Hər zaman özlərim bir öylə cahan
Ki, bütün kainatı eşq olsun,
Gönül uçduqca etila bulsun.
...Qandan əsla görünməsin də əsər... (3, s. 305) -

deyə özünün yeni cəmiyyət və yaşayış ideallarının məzmununu və tələblərini ifadə edir, sevgi, məhəbbət konsepsiyasının məzmununu açırdı. Buna görə "Məhəbbətdir ən böyük din" konsepsiyası məqsədli olaraq sovet dövrü ədəbiyyatşünaslığında başqa səmtə təhlil və izah edilərək müəllifini panislamist kimi təqdim edirdilər. Halbuki ədib dramaturji yaradıcılığının "Şeyx Sənan" tarixindən başlayaraq yeni cəmiyyət, həyat və yaşayış haqqında düşünür, öz fikir və düşüncələrini təqdim edirdi. Fikrimizcə, ədibin əsərlərində tez-tez müraciət etdiyi "təriq", "din" kimi fikirləri isə öz ilkin mənasında deyil, yol, ideya mənasında ədibin bədii-estetik idealı başa düşülməlidir. Buna görə professor Yaşar Qarayevin fikrilə razılaşmaq olar ki, "daha çox epoxalılıq, vüsət və bəşəri məna tragediya üçün, xüsusən romantik tragediya üçün daha çox səciyyəvidir. ...Romantik faciədə tragik konflikt, adətən, "mən və dünya", "mən və varlıq" arasında ziddiyyətləri əhatə edir, əbədiyyət və kainat ölçüləri miqyasında baş verir" (11, s. 98-99). Cavidşünas Gülbəniz Babaxanlının qeyd etdiyi kimi: "Cavid üçün məhəbbət dünyanı, özünü və həyat həqiqətini dərk etmək vasitəsidir, bütün millətləri, xalqları, birləşdirən ideologiya, dünyagörüşüdür, yəni bir dindir" (1, s. 221). Və yaxud da görkəmli cavidşünas Rafael Hüseynovun sözlərilə desək: "Peyğəmbər idim ümmətim olsa", – deyən Cavid yerdə qələmi ilə, ölməz kitabları ilə insana mərhəmət və şəfqətin üzərində qibləgahı, pənahı, ilahisi Gözəllik və Sevgi olan yeni Təriqət, Yeni Din yaratdı – Məhəbbət Dini! Bu da Caviddən bizə qalan ən munis dua: Mənim Tanrım Gözəllikdir, Sevgidir!" (9, s. 19). Bütün bu deyilənlər də onu göstərir ki, Hüseyn Cavid təkcə bir şair, sənətkar deyil, göründüyü kimi, o həm də bir düha, filosof, mütəfəkkirdir. Onun bütün yaradıcılığı, əsərləri onun həyata, dünyaya baxışlarının ümumi konsepsiyasıdır. O, təkcə göstərmək yox, həm də nicatın yolunu da müəyyənləşdirmək istəyi ilə yazırdı. Sənətkar bütövlüyü, ustalığı da burdadır. Sənətkar bütövlüyü elə burdadır ki, Hüseyn Cavid təkcə bəşəriyyətin başına açılan bəlaları göstərməklə qalmır, həm də onun nicat yolunu da müəyyənləşdirməyə cəhd edir. Bu da, sözsüz ki, Cavidin ömrü boyu yaşantılarının, həyat

təcrübəsinin, müşahidə və düşüncəsinin, mütaliələrinin nəticəsi idi, bütövlükdə Cavidin şəxsiyyəti idi.

Cavid bir sənətkar olaraq xalqının övladıdır. Onun mənsub olduğu xalqının əxlaqi-mənəvi sərvətləri, mədəniyyəti, həyata, dünyaya baxışları və sair ədibi bir şəxsiyyət olaraq yetişdirmiş, bir qüdrətli fikir adamı, sənətkar, ədib və mütəfəkkir kimi formalaşdırmışdır. Sənətkar bir növ öz xalqının "səsi", dünyaya, bütün bəşəriyyətə verdiyi istedad və yaradıcılıq töhfəsidir. Demək, Cavidi dilə gətirən, onu sənətdə mövqeləşdirən elə onun xalqının da arzusu, istəyi, ideallarıdır. Buna görə də Hüseyn Cavidin bütün əsərləri milli taleyimizi əks etdirən əsərlərdir, deməli, milli sərvətimizdir. Hüseyn Cavidin bütün əsərləri milli zəmində yazılmış əsərlərdir. …ədəbiyyatın milli məziyyəti yalnız öz xalqının həyatını təsvir etmək yolu ilə əldə edilir (16). Bu baxımdan qüdrətli söz ustadı Hüseyn Cavid xalqının ən yetkin övladı kimi öz əsərləri və sözlərilə xalqının arzularını ifadə edir, xalqının qüdrətli sənətkarı və mütəfəkkiri kimi müdrik və humanist xarakterə sahib xalqı ilə birləşir, xalqının mənsub olduğu humanist və bəşəri dəyərləri öz yaradıcılığında təcəssüm etdirir. Hüseyn Cavid ona görə mütəfəkkir və filosofdur ki, görkəmli elm adamı, akademik İsa Həbibbəylinin qeyd etdiyi kimi: "Onun yaradıcılığında "ideal həqiqət axtarıcılığı, xəyalla həqiqət arasındakı təzad, bu təzaddan doğan bəşəri kədərin bədii təcəssümü, hadisələrin daxili mənasına dərindən varmaq …fəlsəfi baxımdan şərh olunmuşdur" (8, s. 8).

### *ƏDƏBİYYAT*


1. *Babaxanlı G. Azərbaycan ədəbi fikri və Hüseyn Cavid. Bakı: Çaşıoğlu, 2010.*
2. *Cavid Hüseyn. Əsərləri. 3 cilddə, I c., Bakı: Azərbaycan Mədəniyyət Fondu, 2003.*
3. *Cavid Hüseyn. Əsərləri. 3 cilddə, II c., Bakı: Azərbaycan Mədəniyyət Fondu, 2003.*
4. *Cavid Hüseyn. Əsərləri. 3 cilddə, III c., Bakı: Azərbaycan Mədəniyyət Fondu, 2003.*
5. *Əliyev K. Hüseyn Cavid: həyatı və yaradıclığı. Bakı: Elm, 2008.*
6. *Əliyev K. Məhəbbətdir ən böyük din // Cavidşünaslıq (araşdırmalar toplusu). I hissə. Bakı: Elm, 2007.*
7. *Heydər Əliyev və Azərbaycan ədəbiyyatı. Bakı: Elm, 1998.*
8. *Həbibbəyli İ. Cavid sənətində lirizm // Hüseyn Cavid irsi və müasir dövr. Beynəlxalq elmi konfransın materialları. Bakı: Elm, 2007.*
9. *Hüseynov R. Əbədi Cavid. Bakı: Nurlan, 2007.*
10. *İbrahimov M. Sənət aşiqi. "Ədəbiyyat və incəsənət" qəzeti, 1976.*
11. *Qarayev Y. Hüseyn Cavid // Cavidşünaslıq (araşdırmalar toplusu). I hissə. Bakı: Elm, 2007.*
12. *Qarayev Y. Sənətin ilkin və əbədi mövzusu // İsmayıl Vəliyev. Ədəbiyyatda insan konsepsiyası (tarixi təşəkkülü və inkişaf mərhələləri. Bakı: Günəş, 1999.*
13. *Məsud Ə. Eşq və ülviyyət // Cavidşünaslıq (araşdırmalar toplusu). I hissə. Bakı: Elm, 2007.*
14. *Məmməd C. Hüseyn Cavid. Bakı: Azərnəşr, 1960.*
15. *Məmməd T. XX əsr Azərbaycan dramaturgiyasının poetikası. Bakı: Elm, 1999.*
16. *www.csl-az.com\ebaza\lit.az\lit.az-cavid*

# MÜASİR AZƏRBAYCAN NƏSRİNİN REALİST NÜMUNƏLƏRİ

## (Bəxtiyar Vahabzadənin yaradıcılığı əsasında)

**Pərixanım SOLTANQIZI.**
**filologiya üzrə fəlsəfə doktoru, dosent**

Bəxtiyar Vahabzadənin müasir Azərbaycan nəsrinin inkişafında özünəməxsus rolu var. O , müasir nəsrin hekayə janrının ən gözəl realist nümunələrini yaradıb. “Fotoaparat”, “Şübhə”, “Məşhur adam”, “Gölgədə” bu qəbildəndir. Mövzu baxımından orijinal və məzmunca zəngin olan bu hekayələrdə insan talelərindən məişətmizin bu və ya digər tərəflərinə işıq salınır.

“Fotoaparat” ailə-məişət mövzusunda yazılmış lirik-psixoloji hekayədir. İdeya baxımından “Atılmışlar” poemasına yaxındır. Bəxtiyar Vahabzadə poetik əsərində qoyduğu problemi nəsrinə də transfer etmişdir. Bu da onun problemə həssas yanaşmasından irəli gəlmişdir.

Hekayədə gəlin-qaynana münasibətlərinin kəskinləşməsi bir ailənin dağılması, ananın qocalar evinə atılmaq və yaxud özünün bu məkana son nicatı kimi üz tutması təhlükəsini yaratmışdır.

Əsərdə gəlinlə qaynana arasındakı konflikt bədii lövhələrlə əks olunmur. Lakin qaynananın kürəkəninə zəngi və ondan “-Ya anan, ya da arvadın” seçimi etməsi tələbi qaynana-gəlin münasibətlərinin gərginləşməsinin bədii ifadəsinə yönəlir. Seçim qarşısında qalan kürəkən-oğulun düçüncələri gəlinlə qaynananın yola getmədiyini əks etdirir: “İkisinin də günahkar olduğu mənə məlumdur. Anam tündməcaz, arvadım dəymədüşər. Birinin sözü o birinin xirtdəyindən ötmür və ötməyəcək də. Bəs indi nə olsun? O olsun ki, ya gərək arvadımdan keçəm, ya da anamdan “ [1.132].

Müəllif seçimi oğulun ixtiyarına verir. Tərəzinin bir gözündə onun çox sevdiyi arvadı və bu sevgidən doğulan yeganə oğlu. Digər gözündə isə bütün həyatını ona həsr edən, taleyini ona bağlayan ana. Oğul düşünür: “Arvaddan keçə bilmərəm, uşağımın anasıdır, həm də sevirəm. Bəs anamdan necə? Mənim anam analar anasıdır. 23 yaşında dul qalıb, saçının birini ağ hörüb, birini qara, kipriyilə od götürüb. Məni böyüdüb, oxudub. Evləndirib. Bu gündən ötrü? [1.132]. Sanki bu sualı ona şairin özü verir. Onun simasında oğulları vicdanları ilə üz-üzə qoyur. Onları vicdanın səsinə qulaq asmağa çağırır.

Oğlunun ad günündə anasının aldığı fotoaparat onu ötən illərə aparır. Atasız böyümüş, onu ancaq şəkildən tanımışdır. Tibb bacısı işləyən anasının aldığı məvaciblə güclə dolandıqlarından həsrətində olduğu fotoaparatı anası ona ala bilməmişdir. Müəllif oğula vaxtilə seçim qarşısında qalan anasının onu seçdiyini xatırladır. Xalası ilə onlara gələn əminin anası üçün gəldiyini anladığından ondan zəhləsi getmiş, hətta ad günündə ona aldığı hədiyyə - fotoaparata belə yaxın getməmişdir. Anası bunu o gündən başa düşmüş, elçisinin təklifini rədd edərək taleyilə barışmış, həyatını oğluna həsr etmişdir.

Bu detallarla müdrik sənətkar oğulları tutub silkələyir. Onları ittiham edir. Siz-

dən ötrü analarınız həyatlarını qurban verir, sizləri min əzab-əziyyətlə böyüdür, oxudur, ev-eşik sahibi edir. Bəs siz nə edirsiniz? Kürəkəni qarşısında seçim qoyan qaynananın simasında qız analarını tənbeh edir. Onların qızlarının ailə məsələlərinə qarışmalarının acı nəticələrini, ailədə yaranan konfliktləri daha da gərginləşdirdiklərini açıb göstərir, tənqid edir.

"Atılmışlar"da gəlinlərin əmri ilə qocalar evinə atılan anaların, ataların psixoloji düşüncələri verilir. Bu düşüncələrdə onlar niyə qocalar evinə atıldıqlarını götür-qoy edib, gah özlərində, gah da övladlarında günah axtarırlar. Sonda övladlarını bağışlayıb onlardan məhəbbət umurlar. "Fotoaparat"da isə, əksinə, qayınanasının əmrilə seçim qarşısında qalan bir oğulun düşüncələri təsvir edilir. Ana bu seçimdə oğluna yardımçı olur. Nəvəsinə aldığı fotoaparatla "ona arvadını seçməsini, səni atasız böyütmüşəm, sən oğlunu atasız qoyma" demişdir.

Oğul anasının aldığı hədiyyənin mənasını dərk edir. Əsər onun "Bu aparatla indi anam mənə nə demək istəyir" sual dolu düşüncəsi ilə tamamlanır. Hekayənin belə bir sonluqla bitməsi oxucuda onun ailədəki buzları əridəcəyinə, hər iki tərəfdə səmimi münasibətlər yaradacağına bir əminlik yaradır.

"Atılmışlar"dan fərqli olaraq "Fotoaparat"da, müəllif bir ailənin simasında belə bir problemlə üz-üzə gələn onlarca ailədəki konflikti bədii cəhətdən həll etmişdir.

"Şübhə" nağıl-hekayəsini müəllif məşhur nağılçı Hans Xristian Andersenin xatirəsinə ithaf edib. Hekayə nağıllarda olduğu kimi, üç soqal rəqəmi ilə başlayır və onunla da tamamlanır. "Biri varmış, biri yoxmuş. Əndəhar ölkəsində bir qəribə şah varmış... Göydən üç alma düşdü... Biri Əndəhar camaatının, biri kəndlinin, biri də nağıla qulaq asanların". Əslində isə şairin qələmə aldığı bu nəsr nümunəsi həyat səhnəsidir. Elmi ədəbiyyatdan məlumdur ki, nağıllar gerçəklikdən kənar olan bir janrdır. Lakin orada təsvir olunan əhvalatın, hadisənin özündə bir həqiqət var.

Nağıl - hekayədə haqqında danışılan Əndəhar ölkəsinin şahı yalanı sevir. Niyə? Çünki o taxt-taca yalanları sayəsində gəlib. Və yalanlar ilə də ölkəni idarə edir. Hər kəsə də gerçək yaşadığı həyatın tam əksini söylədir. Şahın zınqrovlu təlxəyi də hər yerdə əzbərlədiyi mahnısını oxuyur.

*Mən xoşbəxtəm, xoşbəxtəm,*
*Mənim belə şahım var,*
*Şahım var, padşahım var.*

Digər tərəfdən, şah şübhə, narahat dolu hisslərlə yaşayır. Hər kəsdən şübhələnir. Şübhə onun daxilini didib parçalayır. Həyatı cəhənnəmə dönür. Başında bir sual fırlanır, hey fikirləşir ki, görəsən əsil həqiqəti, onun bic doğulduğunu Əndəhar caamatı bilirmi? Əslində isə hamı gerçəyi bilir, lakin qorxudan susur. Şahı təşvişə salan da elə bu məsələdir.

Bu nağıl-hekayədə əslində şairin məqsədi Əndəhar ölkəsinin şahının nağılını danışmaq olmamışdır. Əndəhar şairin uydurmasıdır. Onun tənqid hədəfi tamamilə başqa səmtə yönəlmişdir. Şah obrazının arxasında Sovet imperiyası dayanır. Əndəhar camaatı Azərbaycan xalqıdır ki, 70 il onun "Məhəbbətinə" inanıb, yalanları ilə yaşamış, ona əl çalmışdır. Əsərdə təsvir olunan zəhmətkeş, xalça toxuyan

kəndli obrazı Azərbaycan xalqını təmsil edir. O, toxuduğu xalçada şahın yalanlarını, iç üzünü ifşa edib ona anladır ki, biz "qoyun" deyilik. Yalanlarını görür və bilirik. Ancaq açıb ağartmırıq. Şahla-kəndli arasındakı dialoqda imperiyanın Azərbaycanın sərvətlərini soyub talamasına, rüşvətxorluğuna işarə olunur:

"Şah əli əsə-əsə əsanı kəndliyə uzadıb dedi:

- Ey mənim ağıllı rəiyyətim, mən sənə qızıl əsa verirəm. Bəs sən öz padşahına nə verə bilərsən?

Kəndli:

- Mən verəcəyimi verdim. Məndən yalan istəmişdin, onu da aldın.

Şah:

- O yalan qulaqlarım üçün idi. Bəs gözlərim, bəs əllərim? Onlar da sevinmək istəyir. Sən mənə də bir hədiyyə ver ki, mənim sənə verəcəyim bu əsa kimi onu gözlərimlə görüm, əllərimlə tutum" [ 2. 101].

Şahın ətrafındakı yaltaq, xain əyanlar da ifşa olunacaqlarından qorxurlar.

Hekayədə təlxəyin söylədiyi nəğməni Azərbaycan xalqı "böyük qardaşının" yalanlarına inana-inana oxumuş, onu xoşbəxt edən ağasını alqışlamış, 70 il onu əsarətində saxlayan şahına əl çalmışdır.

Bu "nəğməni" şah "Azərbaycanlı məmurlarına", onlar da özlərilə birgə əsarətdə yaşayan xalqına əzbərlətmişdir. Şair bu gerçəklikləri "Şah" obrazının arxasında qorxmadan, çəkinmədən, açıq-aydın bədii boyalarla təsvir etmişdir.

"Şübhə" həm də Bəxtiyar Vahabzadənin "Gülüstan"dan gələn ağrı-acısı, yanğısı, odu -alovudur.

"Məşhur adam" müasir Azərbaycan nəsrinin hekayə növünün realist nümunələrindən biridir. Dünənin və bu günün reallığını əks etdirir. Əsərin əsas ideyası düzlükdür, ədalətdir. Hekayənin baş qəhrəmanı olan Muxtar müəllim gerçəkliyi, ədaləti təmsil edir. Ona görə elmdə güzəşt olmaz! Bir tələbənin qiymətini güzəştlə yazanda, digərinin haqqını, ədalətini tapdalamış olursan. O, ali məktəbdə ərəb dilindən dərs deyir. Tələbələrinə ərəb dilini mükəmməl öyrədir. İki il müddətində tələbələri bu dili dərindən mənimsəyir, ərəb dilində tam sərbəst danışa bilirlər. Muxtar müəllimin özünəməxsus dərs üsulu var. Həmkarları onu köhnə üsulla dərs deməsinə görə tənqid edirlər. O da öz işi və əldə etdiyi nəticə ilə onları yerində susdurur. Muxtar müəllim o qədər həqiqətpərəstdir ki, hətta bacısı oğlu üçün elçi gedəndə qız atasına "beləsinə itimi də verməzəm" demişdir. Elçilər əliboş geri qayıtmış, bacısı buna görə ondan incimişdir.

Bəxtiyar Vahabzadə hekayədə ədalətlə ədalətsizliyi üzləşdirir. Çox məşhur olan bir ata siyasi iqtisad fənnindən kəsilən oğlunun qiymətini düzəltmək üçün rektorun yanına xahişə gəlir. Digər ata isə dərs dediyi fəndən öz qızını kəsmiş və onun təqaüddən məhrum edilməsinə səbəb olmuşdur. Buna görə o da rektorun qəbulunda olur, ondan qızının təqaüdünün düzəldilməsini xahiş edir. Rektorun: "Muxtar müəllim, hələ gec deyil. Biz hamımız xahiş edirik, qızının qiymətini düzəlt, sənin xətirinə onu təqaüdə salaq" deməsi [1.46] Muxtar müəllimi möhkəm əsəbiləşdirmişdir O, rektora "Mən bura gəlməmişəm ki, siz məndən qiymət xahiş edəsiniz. Mən bura gəlmişəm ki, o itin balasına təqaüd verəsiniz. Ona görə ki, qiyməti beş də olsa, iki də olsa, o yaşamalıdır. İndi özünüz bilərsiniz" [1.46] cavabını vermiş və incik halda

qəbul otağını tərk etmişdir.

Bu səhnəni təəccüblə süzən məşhur atanın Muxtar müəllim üçün "zəmanə adamı deyil" söyləyib, birbaşa mətləbə keçməsi acı təəssüf doğurur. Bəxtiyar Vahabzadə belələrini tənqid edir, sanki "zəmanə adamı"nın yaxasından tutur, silkələyib sual edir: "Əgər sənin oğluna güzəşt olarsa, başqa birinin haqqı tapdalanmazmı?". Bəs onda ədalət necə olsun? Müəllif insanları ədaləti müdafiə etməyə, hər kəsi öz vicdanının səsini dinləməyə təhrik edir.

Bəxtiyar müəllim uzun illər Azərbaycan Dövlət Universitetində (indiki BDU) müəllim işləmişdir. Tələbələrin təqaüd almalarını sosial həyat tərzlərinin nisbətən yaxşılaşdırılması üçün onlara kömək olunması ilə şərtləndirir. Bu, həm də insanpərvər şairin müəllimlik qayğısından irəli gələn bir məsələ idi ki, onu hekayədə bədiiləşdirmiş və o zamanın da, bu günün də ən aktual mövzularından birinə çevirmişdir.

Yazıçı-şairin "Gölgədə" hekayəsi daha çox tərbiyəvi-əxlaqi əhəmiyyət daşıyır. İdeya cəhətdən şairin "Başqası üçün yaşayanda" hekayəsilə səsləşir. Hekayənin qəhrəmanı Dadaş Qədimovdur. O, gənc yaşında gəmidə baş verən yanğını söndürmüş, gəmidəki insanların həyatını, gəmini xilas etmişdir. Bu hadisə Dadaş Qədimovu bütün həyatı boyu izləyir. O, bu qəhrəmanlığını unutmur, onunla qürurlanır. Bunu hər yerdə, hər zaman, hətta yeni ünsiyyət qurduqlarına da danışır. Özü danışmadığı vaxtlarda da bu hadisəni əzbərləyən nəvəsi, dostları söyləyir. Dadaş Qədimov da bundan çox məmnun qalır. İstəyir ki, hər kəs onu tanısın. Gənc vaxtında necə qəhrəman oğlan olduğunu bilsinlər. Şair-nasir bu qəhrəmanlığın tarixi ilə yaşayan Dadaş Qədimovun həyatını gələcək nəslə bir örnək kimi göstərir. Başqası üçün yaşamağın, yanmağın mənasını aşılayır. İnsan keçmişinə baxanda, "Mən nə etmişəm" deyə düşünəndə utanmamalı, əməlləri ilə öyünməlidir. Müəllif Dadaş Qədimovun bu qəhrəmanlığını təkrar¬-təkrar söyləməsini, xatırlamasını da buna kökləyir. Digər tərəfdən də, Dadaş Qədimovun taleyinə ömründə bir dəfə etdiyi qəhrəmanlığı hər zaman xatırlayaraq yaşamaq, ətrafındakılara təkrar-təkrar söyləyərək əzbərlətmək və ömrünü də belə başa vurmaq düşür. Bu qəhrəmanlıq tək onun psixologiyasında yaşamır. Ətrafındakıların, yaxınlarının psixologyasına da sirayət edir. Onlar hansı məclis olur-olsun, mütləq Dadaş Qədimovun kimliyindən söhbət açmalı idilər. Bu, həm də, bir növ, onların mənəvi borcuna çevrilmişdir. Əks halda, qəhrəmanın siması tündləşər, yalnız təqdimatdan sonra üzünə təbəssüm qonardı. Hörmətli şair İlyas Tapdıq yazır: "Ömrünün gənclik çağlarında bir dəfə gəmidə yanğın söndürən Dadaş Qədimov ancaq bu qəhrəmanlığı ilə yaşayır. Toyda da , yasda da bu əhvalatı hamıya təkrar-təkrar danışaraq əzbərlədir" [3. 149]. İlyas Tapdıq onun qəhrəmanlığına münasibətinin gülüş doğurduğunu da qeyd edir. Əslində isə Dadaş Qədimov haqlıdır. O, kimliyini tanıtmaqla insanlara, gənclərə, insanlığı, başqaları üçün yaşamağın mənasını, gözəlliyini, mübarizliyini təlqin edir. Əgər Dadaş Qədimov gəmidəki yanğını söndürməsəydi, bəlkə də oradakı insanlar həyatlarını itirmək təhlükəsilə üzləşərdilər. Bu faciənin qarşısını isə gənclik çağlarında onunla üzləşən Dadaş Qədimov ala bilmişdir.

Bəxtiyar Vahabzadə bu hekayədə müasir həyatın real hadisələrindən birini – gəmidə baş verən qəzanı və onun qarşısının alınmasını epizodik deyil, informasiya kimi bədii nəsrə gətirmiş, Dadaş Qədimovun simasında, başqalarının yolunda öz həyatını təhlükəyə atan cəsur bir obraz yaratmışdır. İnsanlığın, bir dəfə edilən şücaətin bir ömürə şərəf gətirdiyini sənətkar ustalığı ilə bədii ifadə etmişdir.

### ƏDƏBİYYAT


1. *Bəxtiyar Vahabzadə. Əsərləri. On iki cilddə, I cild, Bakı, "Elm", 2008.*
2. *Bəxtiyar Vahabzadə. Əsərləri. XII cilddə IX cild, Bakı, "Elm", 2008.*
3. *Azərbaycanın Bəxtiyarı. Bakı, "Azərbaycan", 1995.*
4. *Şənbə gecəsinə gedən yol. Bakı, "Azərbaycan", 1991.*
5. *Nizami Cəfərov: "Bəxtiyar Vahabzadə". Bakı, "Azərbaycan", 1996.*



***SUMMARY***

***The realistic examples of modern Azerbaijan prose (According to B.Vahabzadeh's creation)***

*In this article the stories of Bakhtiyar Vahabzade had been scientifically investigated as realistical examples of Modern Azerbaijan prose. In the stories the problems of family, truth, honesty and other humanism principals and the problems - of moral nurture are explained.These principals are analysed scientifically in the fortune of obraz*



***РЕЗЮМЕ***

***Реалистические образц современной Азербайдханской прозы (В основе творчество Б.Вагабзаде)***

*В статье исследуются рассказы Бахтияр Вагабзаде как образцы современной азербайджанской прозы. В рассказах поднимаются вопросы семейно-бытовые, справедливость, гуманистические принципы, а также нравственно-воспитательные вопросы. Эти принципы внедряясь в судьбы образов, исследуются с научной точки зрения.*



*Ключевые слова: рассказ, образ, характер, судба человека, настоящее.*



**Diqqət! Diqqət!**

**Biz Sizə – zəngin pedaqoji iş təcrübəsinə malik orta məktəb müəllimlərinə, elmi-metodik tədqiqatlarla məşğul olan alimlərə müraciət edirik. Azərbaycan dili və ədəbiyyatının tədrisi ilə bağlı iş təcrübələrinə, metodikaya dair yazılara ehtiyacımız var. Jurnalımızla yaxından əlaqə saxlayın və onu məqalələrinizlə təmin edin. Unutmayın ki, o, Sizin jurnalınızdır.**

***Redaksiya.***

# SÖZ GÜCLÜ TƏRBİYƏEDİCİ VASİTƏDİR

**Ayaz QASIMOV,**
**Azərbaycan Dillər Universitetinin dosenti**

Söz ünsiyyət vasitəsidir. Sözün praktik əhəmiyyəti böyükdür. Söz bizim fəaliyyətimizi, davranışımızı nizamlayan, mövcud təsəvvürləri canlandıran, emosional, ilıq, yaxşı və ya pis münasibət yaradan nitq vahididir. O, məişətdə, ictimai və şəxsi həyatda güclü və əsas rol oynamaqdadır. Sözün gücü, təsir qüvvəsi çox böyükdür. Söz adamda hansısa bir hadisə ilə bağlı qəzəb və nifrət, sevinc və xoşbəxtlik, utancaqlıq və cəsarət kimi hisslər oyadır, insanda xoş və ya pis əhval-ruhiyyə yaradır. Onun təsir dairəsi genişdir. Söz güclü tərbiyə vasitəsi kimi atalar sözlərinə, aforizmlərə, müdrik kəlamlara çevrilə bilir. Məsələn, "Qılınc yarası sağalar, söz yarası sağalmaz".

Sözü elə işlətmək gərəkdir ki, o, lətafətini, ətrini, duzluluğunu, şirinliyini itirməsin. Sözün gücü danışanın dili bilmək səviyyəsindən, nitq mədəniyyətindən asılıdır. Ünsiyyət zamanı elə sözlər seçilib işlədilməlidir ki, fikir dinləyicilərə tam aydın olsun, onlarda xoş hisslər yarada bilsin. Nitqin ifadəliliyi və dəqiqliyi onun lakonikliyi ilə bilavasitə bağlıdır. Söz dinləyicilərə və ya oxuculara o zaman effektli təsir göstərə bilər ki, o həqiqi və məcazi mənalarda dürüst və yerli-yerində işlədilsin.

Söz dilin ən əsas ünsürüdür. İnsanlar həmişə düşünür, ona görə ki, söz yalnız məfhumun varlıq forması deyil, eyni zamanda o, təfəkkür vasitəsidir. Dil həmişə zamanla ayaqlaşır, inkişaf edir. Lüğət fondu yeni sözlər hesabına zənginləşir. Məsələn, hazırda "helikopter", "kreativ", "penitensiar xidmət" və digər əcnəbi sözlər dilimizə daxil olmuşdur. Bu, Avropaya, dünyaya inteqrasiya etməyin təzahürüdür.

Söz dilin ilk vahididir. Ünsiyyət qurmaq üçün deyiləsi fikirlər sözlərdən düzəlmiş ifadə və cümlələrdən ibarət olur. Ona görə də söz seçiminə diqqətli olmaq vacibdir. Söz sərrafları – şairlər, yazıçılar, alimlər, müəllimlər, dahi şəxsiyyətlər sözə yüksək qiymət vermişlər. Məsələn, görkəmli Azərbaycan şairi Rəsul Rza yazırdı ki,

*Söz çıxıb ceyran dağına,*
*dəli könlüm həsrət qalıb*
*bir qafiyə vüsalına.*

*"Yaradıcılıq prosesində şair döyüşür, istədiyi* ***sözü****, təşbehi, qafiyəni tapmaq üçün yorulub haldan düşənə qədər fikirləşir. Sanki* ***söz*** *və ifadələr qələm sahibi ilə pələng kimi güləşir... fikirlərini kağız üzərinə həmişəlik mismarlayana qədər çox böyük mənəvi qüvvə itirir" (7, s.48).* Yaradıcı insanların təbirincə, bu hal *"**söz** tapmaq əzabı"* adlandırılır.

"Yaxşı söz də cəvahir kimidir, hamı onu qulağından asar" (Huma Tədrizi).

Demək lazımdır ki, nəzakətli və ədəbli danışıq insanı ucaldır, onun hörmət və nüfuzunun artmasına zəmin yaradır. Dahi şairimiz Səməd Vurğun yazırdı:

*Nahaq* ***söz*** *od vurar qəlbə, lakin haq* ***söz*** *keçər daşdan,*

*Ucuz* ***söz*** *qan qaraldar ki, küsərsən dostla sirdaşdan.*

***"Söz*** *yarası"* adlı məqaləsində tibb elmləri doktoru, professor H.Kərimov **sözün** sağlamlıq baxımından əhəmiyyətini qiymətləndirərək deyir ki, xoş **söz,** xoş rəftar sağlamlıq üçün ən vacib dərmandır. Kobud **söz** orqanizmdə ciddi xəstəliklərin

meydana gəlməsinə səbəb olur. Arteriosklerozun, hipertoniyanın, ürək infarktının əmələ gəlməsində kobud söz və təhqiramiz danışıqda infeksiya, istirahət və qidalanmanın pozulması qədər ciddi rol oynayır.

Antik dövrün böyük mütəfəkkiri və loğmanı Hippokrat demişdtir ki, **təbabət** üç nəhəngin çiynində dayanır: bitki, bıçaq və **söz**. Lakin bu sırada üçüncü daha lazımdır və hər yerdə var.

Xalqımızın bu əsasda çoxlu atalar sözləri və hikmətli ifadələri mövcuddur:

*Qılınc yarası sağalar, **söz** yarası sağalmaz.*

*Xoş **söz** könül açar, ucuz **söz** qan qaraldar.*

*Pis **söz** zəhrimardan acı olar.*

***Sözün** yaxşısı baldan şirindir.*

*"Danışanda elə danış, deyiləsi **söz** olsun,*

*Dalaşanda elə dalaş, barışmağa üz olsun" və sair.*

Dahi Nizami Gəncəvi yazırdı:

*"Sordum köhnə qızılmı, təzə **sözmü** yaxşıdır.*

*Dedi insan sərrafı: **söz** dünyanın naxışıdır".*

Şair Ə.Əlibəyli də bu xüsusda çox gözəl və obrazlı şəkildə belə demişdir:

*Dilin acılığını*
*nə diş, nə dodaq bilər.*
*Dilin acılığını*
*eşidən qulaq bilər.*
*Bir də bulanan ürək,*
*od tutub yanan ürək.*

Nəzakətli ünsiyyətə verilən tələblərin az və ya çox dərəcədə hamı tərəfindən gözlənilməsi, nitqin hər növ təhqiramiz söz, ifadə və cümlələrdən qorunması da öz növbəsində adamların **sağlamlığı** və **uzunömürlülüyü** üçün böyük təminatdır. Xalqımızın özü ilə yaşıd olan aşağıdakı atalar sözləri və hikmətli ifadələr də bu əsasda yaranmışdır:

*"Əvvəl düşün, sonra danış".*

*"Xoş söz dəmir qapını açar".*

*"Söz qılıncdan kəsərlidir".*

Söz qüdrətlidir, söz müdrikdir, sözün mənası dərindir. Çox haqlı olaraq bir atalar sözündə deyilir: *"Söz var adamı dağa çıxarar, çöz var dağdan endirər".* Doğrudan da, sözün hikməti böyükdür. Məsələn, *"zəhmət olmasa", "lütfən", "qadan alım"* sözləri, yaxud ruslarda *"пожалуйста", "будьте добры"* və sair sözləri ilə müraciət olanda, adam istəməsə də həmin xahişin qarşısında yumşalır və əksər hallarda o xahişi yerinə yetirir. Danışarkən sözlərdə vurğu yerli-yerində olmalıdır ki, fikri, məzmunu tutmaq, başa düşmək mümkün olsun. Bəzən elə olur ki, danışanın fikrini tutmaq çətinləşir, bəzən də heç mümkün olmur. Elə bizim televiziya kanallarındakı bəzi diktorlar, aparıcılar kimi. Sanki qovan var, bir dəqiqəyə bunları danışmasan, tufan qopar. Görünür, elə buna görə böyük Füzuli xəbərdarlıq edirmiş:

*Ey könül, söz xəzinəsin açsan,*
*Dinləyən şəxsi gözlə, yormayasan.*

Xaqani də aram-aram, sakit danışmağın tərəfdarı olub:

*Az-az, təvazölə danış **sözünü**,*
*Döşünə döyüb də öymə özünü.*

Danışıq bulaq suyu kimi axıcı, bal kimi şirin, musiqi kimi ahəngdar və dərin məzmunlu olmalıdır ki, dinləyiciləri əfsunlasın, şüurlarına və davranışlarına təsir etsin.

**Söz** kəsərli ünsiyyət vasitəsidir və eyni zamanda tərbiyəedici xüsusiyyətə malikdir, əsil həyat dərsliyidir.

İnsanlar arasında ünsiyyətin başlıca vasitəsi dildir. Səslərin müəyyən məna verən birliyi kimi formalaşan **sözlər, söz-birləşmələri** və cümlələrdən qurulan dil fikrin bilavasitə gerçəkliyidir, insanlar

arasında ən mükəmməl qarşılıqlı anlaşma vasitəsidir.

Bədii **söz,** obrazlı ifadə və poetik cümlələr "söz ustalarının" dilində qüdrətli ideya silahına, çox inandırıcı və etibarlı tərbiyəvi təsir vasitəsinə çevrilir. İndi insanların elmi-mədəni səviyyəsi sürətlə artır, kütləvi informasiya vasitələri gündən-günə genişlənir, yazılı və şifahi ünsiyyətin formaları da get-gedə çoxalır. Təhsil alanların şüuruna və qəlbinə yol tapmaq üçün hər bir vasitədən, o cümlədən hikmətli sözlərdən, aforizmlərdən, müdrik kəlamlardan istifadə mühüm yer tutmalıdır. İndi canlı, açıq və məzmunlu söz deməyi bacarmaq çox vacibdir. Gələcəyimiz olan uşaqları (gəncləri) əxlaq prinsipləri əsasında tərbiyə etmək olduqca zəruridir. Bu o deməkdir ki, belə prinsiplər, yəni mənəvi saflıq, düzgünlük, doğruçuluq, sadəlik, təvazökarlıq, ailədə, işdə və ictimai yerlərdə mehribançılıq, qayğıkeşlik, uşaqların (gənclərin) tərbiyəsinə məsuliyyət hissi ilə yanaşmaq, cəmiyyətə zidd halları aradan qaldırmaq, vətənin sərhədlərini qorumaq, itirilmiş ərazilərimizi geri qaytarmaq işində fəal olmaq, ölkəmizlə bağlı həqiqətləri dünya birliyinə çatdırmaq hər kəsin həyat mövqeyi olmalı və əməli fəaliyyətimizin əsasında durmalıdır.

Söz – sərrast seçilmiş, müdrikliklə dolu canlı, inandırıcı, kəsərli, obrazlı olduqda böyük tərbiyəvi təsir gücünə malik olur. Dilimizin lüğət tərkibinin zənginliyi, söz ehtiyatının bolluğu, qrammatik quruluşu, məna və üslubiyyat cəhətdən aydınlığı, bədiiliyi və obrazlılığı, poetikliyi geniş imkanlar yaradır. Doğma ana dilimizin – dövlət dilinin – bütün imkanlarından səmərəli istifadə etmək hər bir Azərbaycan vətəndaşının müqəddəs borcu olmalıdır.

Qüdrətli sözlər əsasında qurulmuş məntiqi söhbətlər gözəl nəticələr verir. Dəbdəbəli danışmaqdansa, öz nitqinə bəzək-düzək verməkdənsə sadə, aydın, yığcam, məntiqli, obrazlı danışmaq daha yüksək qiymətləndirilir. Nitqin ana dilinin fonetik, leksik, qrammatik, orfoepik, üslubi və ədəbi tələffüz normalarına uyğun qurulması çox əhəmiyyətlidir, qəliz terminləri, lüzumsuz alınma əcnəbi sözləri kənara atmaq lazımdır.

Xüsusilə nitqin lüzumsuz alınma sözlərlə zibillənməsi və bayağılaşdırılması dözülməzdir.

L.N.Tolstoy deyirdi ki, əlimdə ixtiyar olsaydı, mənasını bilmədiyi söz və ifadələri işlədən hər kəsə 100 qamçı vurdurardım. Deməli söylənilən sözün mənasına fikir vermək lazımdır. Ünsiyyətin kamillik dərəcəsi nitq mədəniyyətidir. Ana dilinin söz xəzinəsi üzərində qurulmuş gözəl nitq özü də mədəniyyətdir. Ziyalılar ordusu nəzakətli danışığı, incə müraciəti, etinalı hərəkəti və ədəbli davranışı ilə kütlələrə layiqli nümunə göstərməlidir. Söz də güclü silahdır, düz atanda düz vurur.

Nitq mədəniyyəti daimi nəzarət altında olsa, mətbuat, radio və televiziya proqramlarında bu məsələlərin şərhinə vaxtaşırı yer ayrılsa, mövcud nöqsanlar azala-azala yoxa çıxar. Nitq üslubiyyatı, nitqin leksik ehtiyatının zənginliyi, sözün təsiri, danışıq etikası, nəzakətli ünsiyyət məsələləri alimlərimizin diqqətindən kənarda qalmamalı, vaxtaşırı müzakirələr keçirməklə nitq mədəniyyətinə yiyələnməyin nə dərəcədə əhəmiyyətli olduğu müəyyənləşməlidir.

Əvvəla, unutmaq olmaz ki, nitq mədəniyyətinə yiyələnmək ümumi dil mədəniyyətinin zənginləşdirilməsini şərtləndirir. İkincisi, ədəbli və nəzakətli danışıq insan üçün böyük şərəfdir, ucalıqdır, insanın hörmət və nüfuzunu artırır.

Xoş rəftar, mehribanlıq, möhkəm birlik, firavan həyat və xoşbəxtlik də nəzakətli

ünsiyyətdən mayalanır, qidalanır. Ədəbi dilimizin cilalanaraq zənginləşməsi, tüfeyli ifadələrdən, vulqarizmlərdən tədricən təmizlənməsi nitq və ümumi dil mədəniyyətini inkişaf etdirir.

Ünsiyyət və nitq o zaman gözəl olur ki, o, təmənnasız münasibətdən irəli gəlsin, təmənnalıq şəraitində isə o, yaltaqlığa çevrilir və dinləyicilərə mənfi təsir bağışlayır.

Nitq mədəniyyəti ilə bağlı Keykavusun "Qabusnamə"sinə müraciət etsək, çox ibrətamiz bir tövsiyəyə rast gələrik: *"Ey oğul, bütün sənətlər içərisində ən gözəli natiqlikdir. Dilini gözəl danışmağa öyrət. Dili xoş olanın havadarı çox olar. Onu da bilməlisən ki, söz dörd cürdür, birini nə bilərlər, nə də deyərlər. Birini deyərlər, lakin bilməzlər. Birini bilərlər, amma deməzlər. Birini də həm bilərlər, həm də deyərlər".*

Dilimizdə elmin, texnikanın müxtəlif sahələrinə aid terminlər, onların arasında arxaizmlər və neologizmlər, dialektizm və jarqonizmlər, vulqarizm və tabular mövcuddur. Şübhəsiz ki, bu tip sözləri müxtəlif mütəxəssislər bilir və istifadə edir, hamının bilməsinə ehtiyac yoxdur. Xeyli söz dilimizə ərəb-fars, rus-Avropa, türk-monqol dillərindən keçib ki, biz onların mənasını bilmədən işlədirik. İnsanın təbii-fizioloji ehtiyaclarını, bədən üzvlərinin adlarını, söyüş və qarğış bildirən sözləri hamı bilsə də, abır-həya, etika normaları onları işlətməyə imkan vermir. Dilimizdə kifayət qədər ümumişlək söz və ifadələr var ki, onları hamı bilir və istifadə edir. Odur ki, ünsiyyət zamanı hər bir söz və ya ifadəni işlətməkdən əvvəl düşünmək məsləhətdir.

Yüksək nitq mədəniyyətinə sahib olmaq ümumbəşəri keyfiyyətdir. Nitq mədəniyyətinə verilən tələblər bütün dillərə aiddir və işlənmə məqamı düzgün seçilməli, nitqi incə və nəzakətli sözlər ilə qurmaq mehribanlıq, məhəbbət və birlik yaradır. Eləcə də əksinə. Yadda saxlamaq kifayətdir ki, ana südü fiziki yetkinliyin rəhnidirsə, ana dili, yüksək nitq mədəniyyəti, mənəvi kamilliyin mayasıdır. Yüksək nitq mədəniyyətinə yiyələnmək – xalqımızın ümumi milli mədəniyyətinə yiyələnməyin ən mühüm şərtlərindən biridir.

Avropaya, dünyaya inteqrasiya prosesində ünsiyyət olduqca vacib, əvəzolunmaz bir vasitəyə çevrilmişdir. Ona görə də indi insanın etik və estetik müstəvidə nitq mədəniyyətinə yiyələnməsinə mühüm əhəmiyyət verilir.

İnsanlar arasında ünsiyyətin əsasında söz durur. Söz ən mühüm təsir vasitəsidir. Azərbaycan xalqının yaratdığı müdrik kəlamlarda bu aydın şəkildə görünür. Məsələn, "*Adam ağzından söz, qazan altından köz", "İgidi söz, kababı köz öldürər".*

Adətən, adamların bir-birinə münasibətində maddi həyata münasibətində söz, ifadə və cümlələrdən istifadə olunur. Yaxşı münasibət öz əksini xoş təsirli, incə sözlərdə, pis münasibət isə bəd təsirli, kobud və təhqiramiz sözlərdə tapır. Məsələn, *"əziz dostum, qardaşım", "səninlə hər görüşüm mənim üçün böyük sevincdir", "nə vaxt istəsən gəl, əziz qonağımsan", "qadan alım", "qurban olum", "Allah səni qorusun"*. Belə sözlər, müraciətlər, şübhəsiz ki, xoş əhval-ruhiyyə, müsbət emosiya yaradır. Yaramaz, alçaq, yaltaq, səni görmək istəmirəm, sənə haram olsun və sair kimi kobud və təhqiramiz sözlər isə insanın əhval-ruhiyyəsinə, hətta səhhətinə də çox pis təsir edir. Atalar demişdir ki, "pis söz eşidəndə susmaq ən yaxşı cavabdır".

Ədəbsiz danışıq, söyüş və qarğış insanın

şərəf və ləyaqətinin təhqiri sayılır, bəzi hallarda isə cinayət hesab edilir.

İ.P.Pavlov sözə böyük əhəmiyyət verərək, elmi cəhətdən sübut etmişdir ki, *"Söz insan üçün ən güclü və əvəzsiz mənəvi təsir vasitəsidir"* (3, s.77). Ona görə deyirlər ki, *"qılınc yarası sağalar, söz yarası sağalmaz". "Pis söz zəhrimardan acı olar", "Sözün yaxşısı baldan şirindir"* kimi Azərbaycan atalar sözləri buna parlaq misaldır. Azərbaycan xalqı nəzakətli ünsiyyət məsələlərinə həmişə ciddi əhəmiyyət vermişdir və indi də hamıya bunu tövsiyə edir. Hesab edirik ki, dildə çoxdan yaranmış tabu və evfemizm qaydalarından istifadə olunmasına fikir vermək hamı üçün faydalı olar. Yada salaq ki, "tabu" - nitqdə işlənməsi qadağan sayılan söz və ifadə mənasını verir. "Evfemizm" isə yaxşı danışmaq, nəzakətli danışmaq deməkdir.

*"İnsan məhəbbətin övladıdır",* onun qazancı, bəxşişi və mükafatı da məhəbbət olmalıdır. Başqasının məhəbbətini qazanmaq üçün isə ilk növbədə gözəl danışmaq, nəzakətli ünsiyyət qurmaq vacibdir. Görkəmli rus yazıçısı A.P.Çexov çox doğru olaraq demişdir ki, insanda nə varsa hamısı – üzü də, geyimi də, davranışı da, qəlbi də, fikri də, danışığı da gözəl olmalıdır.

İnsana aid olan davranışın əsasında ünsiyyət durur. Ünsiyyət olmadan kimin necə adam olduğunu bilmək olmur. Kimin mədəni, nəzakətli və ya kobud, mədəniyyətsiz olduğunu ünsiyyət prosesində başa düşmək mümkün olur. Deməli, mədəni, tərbiyəli və nəzakətli adam yüksək nitq və davranış mədəniyyətinə yiyələnmiş adamdır desək səhv etmərik.

Nəzakətli ünsiyyət uşağın dil açan ilk günlərindən öyrədilməlidir. Uşağın leksik ehtiyatında valideyn kobud sözlərə yer verməməlidir. Bu yanaşma uşaq bağçalarında və digər təhsil müəssisələrində möhkəmləndirilib zənginləşdirilməlidir. Uşaqlar böyüklərə, bir-birinə müraciətdə xoş sözlərdən istifadə etməyə alışdırılmalıdırlar. Məsələn, *atacan, anacan, bacı, qardaş, yoldaş, müəllim, bəli, xeyir* kimi sözlərdən ibarət cümlələr qurmağı bacarmalıdırlar. Əgər hardasa kobud "*ə, az, ağəz, ədə, əşi, hə, hı"* sözlərini eşidib işlədirlərsə, bu sözlərin istifadəsindən yayındırmağa, onların ekvivalenti olan incə və nəzakətli sözləri öyrətməyə çalışıb nail olmaq məqsədəuyğun sayılmalıdır.

Şagirdlərin (həm də gənclərin) ünsiyyəti üçün zəruri sayılan nəzakətli, incə sözləri bədii ədəbiyyata istinadən qruplaşdırmaq istəsək, təxminən belə bir səhnə alınar: *İlk tanışlıq və vaxtaşırı görüş zamanı işlədilən sözlər. Nəvazişkarlıq və əzizləmə zamanı işlədilən sözlər (sözlərə müxtəlif titul və morfemlər əlavə etməklə, məsələn,* ***bibi, dayı, can****). Üzürxahlıq mənasında işlədilər sözlər. Dəvətetmə zamanı işlədilən sözlər. Xudahafizləşən və ya vidalaşan zamanı işlədilən sözlər. Xoş arzuları bildirmək zaman işlədilən sözlər. Razılıq və əzizləməni əks etdirən sözlər. Təbrik və təşəkkür ilə bağlı sözlər. Yas mərasimlərində başsağlığı vermək üçün işlədilər sözlər. Narazılıq, qəzəb, hədə-qorxu, öyüd-nəsihət ilə bağlı işlədilən sözlər.*

Ulu babalarımız gələcək nəsillərin "qulağında sırğa olacaq" hikmətli sözləri möcüzələr kimi ifadə etmişlər. Cavan Hüseynin aşağıdakı poetik nümunələri buna parlaq misaldır.

*Söz var ki, deyəndə dodaq büzülür,*
*Söz var ki, ürəkdən gəlir süzülür.*
*Söz var ki, ordu tək səfə düzülür,*
*Sözün özünün də öz sərhəngi var.*
*Söz var ki, göhərdən, ləldən qiymətli,*
*Söz var ki, həyasız, söz var ismətli.*
*Söz var ki, mənalı, güclü, qüvvətli,*

*Söz var ki, düşmənlə açıq cəngi var.*
*Elə söz var – tamsınanda ağı tək,*
*Elə söz var – üryan qılınc, yağı tək.*
*Elə söz var – böyük Ağrı dağı tək,*
*Sözün özünün də ağır-səngi var.*
*Elə söz var – bahar kimi, yay kimi,*
*Elə söz var – günəş kimi, ay kimi.*
*Elə söz var – kaman kimi, yay kimi,*
*Elə söz var – zəhərli xədəngi var.*
*Elə söz var –zəhrimardan acıdır,*
*Elə söz var – söhbətlərin tacıdır.*
*Söz var – Koroğlunun öz qılıncıdır,*
*Söz var ki, xalqına zəfər-zəngi var.*

Ulu müdriklər vaxtilə geniş formada söylənilmiş hikmətli fikirləri daha lakonik şəkildə ifadə edərək atalar sözü və məsəl şəklinə salmışlar. Nəticədə belə müdrik kəlamlar yaranmışdır:

*"Çox danışmaq gümüşdürsə, az danışmaq qızıldır".*

*"Az danış ki, sözünün qədri bilinsin".*

Böyük Nizaminin təbirincə isə:

*"Sözün də su kimi lətafəti var,*
*Hər sözü az demək daha xoş olar".*

Ölməz Füzuli "Söz" rədifli qəzəlində yazır:

*Artıran söz qədrini, sidq ilə qədrin artırar,*
*Kim nə miqdar olsa, əhlin eylər ol miqdar söz.*

Sözün qədir-qiyməti Xətai poeziyasında da öz əksini tapmışdır:

*...Söz vardır kəsdirir bası,*
*Söz vardır kəsər savaşı.*
*Söz vardır agulu aşı,*
*Bal ilən edər yağ, bir söz.*

Müdrik şairimiz S.Vurğunun söz haqqında qənaəti belədir:

*Əzəldən belədir sözün hünəri,*
*O, daşa dil verir, torpağa qanad.*
*Onunla ucalır xəyal şöhrəti,*
*Önündə diz çökür bütün kainat.*

İncə və nəzakətli, ədəbli danışmaq, mərifətli, mədəni və ismətli, ləyaqətli davranış, nəcib əməllər sahibi olmaq damla-damla qazanılır ki, bu da insanı hörmətli, ədalətli, şöhrətli, mərhəmətli edir. Belə insanlar müdrik sayılırlar.

İngilis alimi S.Smayls çox doğru demişdir ki, ədəbsiz söz və bəd rəftar bütün ürəklərin qapılarını bizim üzümüzə bağlayır, nəzakətli danışıq və xoş rəftar elə bir tilsim rolunu oynayır ki, onun müqabilində bütün gənclərin və qocaların ürək qapıları bizim üzümüzə taybatay açılır.

İndi də sözün qüdrətli olduğunu bildirən bir neçə müdrik kəlama müraciət edək:

*Öz ana dilini bilməyən adamlar şikəst adamlardır.* ***(Heydər Əliyev)***

*Az söz ərin mülküdür, çox söz heyvan yüküdür.* ***(Yunis İmrə)***

*Hər kimin olarsa bir şirin dili,*
*Tük ilə o çəkər dalınca fili.* ***(Sədi Şirazi)***

*Avara adam çox danışan olar.* ***(Monteskyö)***

*Sözü söylə alana, qulağında qalana.* ***(Azərbaycan atalar sözü)***

*Şirin dil ilanı da yuvasından çıxarar.* ***(Azərbaycan atalar sözü)***

*Bəşər düşüncəsinin və təcrübəsinin saysız xəzinələri min illər ərzində toplanaraq sözdə əbədi yaşayır.* ***(Şoloxov)***

*Gerçəkliyi astar üzünə çevirən və bu astar üzün necəliyini göstərən roman, mənim fikrimcə, can atmalı olduğumuz ideala yaxındır.* ***(Q.Markes)***

*Cəvahir toz-torpağa batsa da yenə qiymətini itirməz, toz-torpaq göyə qalxsa da yenə qiymətə minməz.* ***(Sədi Şirazi)***

*Adam var yanında olsan bir qədər.*
*Tamam unudular dərdin, məlalın.*
*Adam var bir kəlmə danışsa əgər,*
*Dəymişin durmuşkən tökülər kalın.* ***(B.Vahabzadə)***

*Quş dimdiyindən, insan dilindən tələyə düşər.* ***(Azərbaycan atalar sözü)***

*Özünüz haqda danışmağa çalışmayın, onsuz da siz çıxıb gedəndən sonra haqqınızda o ki var danışacaqlar.* ***(U.Mizner)***

*Öz halına uyğun deməsən sözü,*
*İstəyin qəbula yetişməz düzü.* ***(M.Dəhvədi)***

*Hamını tərifləyən adam başqalarını qiymətləndirə bilməz.* ***(Samuel Sekson)***

*Söz böyük şeydir. Ona görə böyükdür ki, sözlə insanları birləşdirmək də olar, ayırmaq da, sözlə məhəbbət də qazanmaq olar, ədavət və düşmənçilik də.* ***(Tolstoy)***

*Ədəb sayılsa da məclisdə susmaq,*
*Məsləhət zamanı danışmaq gərək.*
*İki şey ağıla nöqsan sayılır,*
*Yersiz susmaq ilə, yersiz söz demək.* ***(Sədi Şirazi)***

*Az bilib çox danışmaq axmaqlıq əlamətidir.* ***(S.Ə.Şirvani)***

*Sirrini hər kəsdən gizli saxla sən,*
*Ehtiyat sahibi çox yaxşı bilir:*
*Sirrin gizlidirsə əsirdir sənə,*
*Açdınsa sən oldun sirrinə əsir.* ***(İbn Sina)***

*Susmağı bacarmayan pis danışar.* ***(Apuley)***

*Həqiqi ziyalı boş yerə danışmaz, bacarmadığı işə girişməz, görməyəcəyi iş üçün heç kəsə söz verməz, ancaq öhdəsindən gələ biləcəyi işləri boynuna götürər.* ***(B.Mahavina)***

*Sənətin və elmin dünyası öz xeyrini güdmədən xalqa edilən xidmətdədir.****(Yan Raynis)***

*Hər bir yazıçı öz yazısında xəta olmadığını iddia edə bilməz. Yalnız yazıçı olmayanlar o cür düşünə bilərlər.* ***(F.Volter)***

***ƏDƏBİYYAT***


1. Babayev A., Azərbaycan dili və nitq mədəniyyəti. Bakı, 2014.
2. Əliyev K., Natiqlik sənəti. Bakı, Azərnəşr, 1994.
3. Pavlov İ.P. Əsərləri, külliyyatı. 3-cü cild, Bakı, 1934.
4. Sadıqov F.B. Pedaqogika. Bakı: “Adiloğlu”, 2012.
5. Жигулев А.М., Сила образного слова. Москва, “Знание”, 1979.
6. Иванова С.Ф., Специфика публичный речи. Москва, “Знание”, 1978.
7. Инбер В., Вдохновение и мастерство. Москва, 1961.

# X-XI SİNİF ŞAGİRDLƏRİNDƏ FƏAL VƏTƏNDAŞLIQ MÖVQEYİNİN FORMALAŞDIRILMASI: ƏDƏBİYYAT DƏRSLİKLƏRİNİN TƏHLİLİ

**Emilya HÜSEYNOVA,**
**ADPU-nin dosenti**

***Açar sözlər:*** *ədəbiyyat dərsliyi, X-XI sinif şagirdləri, vətəndaşlıq, vətəndaşlıq tərbiyəsi, fəal vətəndaş, vətəndaş mövqeyi, fəal vətəndaş mövqeyinin formalaşdırılması.*

***Ключевые слова:*** *учебник литературы, учащихся 10-11классов, гражданство, воспитание гражданства, активный гражданин, гражданская позиция, формирование активного гражданства.*

***Keywords:*** *literature textbook, students in grades 10-11, citizenship, citizenship upbringing, active citizen, citizenship, the formation of active citizenship.*

Yuxarı sinif şagirdlərində fəal vətəndaşlıq mövqeyinin formalaşdırılması baxımından ilk növbədə X sinfin ədəbiyyat dərsliyinin təhlilini apardıq. Ədəbiyyat fənni elədir ki, onun proqram və dərsliklərində tərbiyənin, o cümlədən milli tərbiyənin istənilən sahəsi, istənilər tərkib hissəsi üzrə məktəblilər arasında iş aparmaq, onların mənəvi şüuruna, mənəvi düşüncəsinə məqsədyönlü təsir göstərmək, onlarda mənəvi təfəkkürü, mənəvi davranış və rəftar tərzini inkişaf etdirmək mümkündür.

Deyilən fikir baxımından ədəbiyyat dərslikləri məktəblilərin fəal vətəndaşlıq mövqeyinin formalaşdırılması üçün zəngin material verir, bu, təbiidir. X sinfin "Ədəbiyyat" dərsliyinin giriş hissəsində oxuyuruq: "Ədəbiyyat insanın, cəmiyyətin hisslərini, düşüncələrini, arzu və istəklərini obrazlı şəkildə əks etdirən söz sənətidir. ...Ədəbiyyat, ümumən sənət varlığı, həyatı dərk etməyin elmdən sonra ikinci əsas vasitəsidir. ...Ədəbiyyatın vəzifələrindən biri zövq verməkdirsə, ikincisi, insanları tərbiyə etmək, onlara gözəl mənəvi, əxlaqi sifətlər aşılamaq, həyatda düzgün mövqe tutmaqda kömək göstərməkdən ibarətdir. Dünya, eləcə də Azərbaycan ədəbiyyatının görkəmli nümayəndələri, klassik sənətkarlar həmişə ədəbiyyatın tərbiyəedici imkanlarına xüsusi fikir vermiş, öz əsərlərində böyük idealların, müqəddəs məramların, arzuların daşıyıcısı olan kamil qəhrəmanlar yaratmışlar. ...Ədəbiyyat cəmiyyəti qüsurlardan təmizləməyə, insanları mənən, ruhən saflaşdırmağa çalışmışdı" (1, s. 3).

Nəzərdən keçirdiyimiz problemlə bilavasitə bağlı mövzular üzərində dayanaq.

Dərslikdə özünə yer alan birinci mövzu "Azərbaycan şifahi xalq ədəbiyyatı"dır. Burada nəğmələr (o cümlədən əmək nəğmələri, holavarlar, sayaçı sözlər, mərasim nəğmələri, ağılar, mövsüm nəğmələri, qəhrəmanlıq nəğmələri, məişət nəğmələri); eyni zamanda laylalar, oxşamalar, mahnılar, bayatılar, əfsanələr,

rəvayətlər, lətifələr, nağıllar, atalar sözlər və məsəllər, tapmacalar, oyunlar, xalq tamaşaları, aşıq yaradıcılığı, dastanlar diqqət mərkəzinə gətirilir, aydınlaşdırılır, nümunələr verilir.

Qəhrəmanlıq nəğmələri, mahnılar, bayatılar, əfsanələr, rəvayətlər, nağıllar, atalar sözləri və məsəllər xüsusən X sinif şagirdlərində vətəndaşlıq mövqeyinin təşəkkül tapıb formalaşdırılması, fəal mövqeyin inkişaf etdirilməsi baxımından son dərəcə əhəmiyyətlidir. "Azərbaycan şifahi xalq ədəbiyyatı" mövzusu üzrə materiallarda yeri gəldikcə vətənpərvərlik, vətən sevgisi yada salınır, nümunələr verilir. Bütün bunlar vətəndaşlıq keyfiyyətlərinin tərbiyə olunmasına kömək göstərir.

Haqqında danışılan fəsildə qəhrəmanlıq nəğmələrindən danışılarkən Koroğlu, Qaçaq Nəbi, Qaçaq Kərəm və qatır Məmməd kimi elm qəhrəmanlarının dilindən səslənən nəğmələr diqqətə çatdırılır. Təbii ki, mənsub olduqları torpağın fəal, ləyaqətli vətəndaşı olmaq etibarilə onların fəaliyyəti, xalqın hüquqlarının müdafiəsi, onların cəmiyyətdə layiqli mövqe tutmaları, dolanışığının təmin olunması, bir şəxsiyyət kimi onlara hörmət edilməsi və s. uğrunda mübarizə aparırlar. Adətən belə insanları hakim dairələr şirnikdirmək, mükafatlandırmaq yolu ilə öz tərəflərinə çəkmək istəyirlər. Bəzi şəxslər buna uyur, lakin möhkəm iradəyə, inama və əqidəyə malik olanları öz yollarından heç bir qüvvə döndərə bilmir. Onlar öz şəxsi maraqlarından, mənafelərindən, şəxsi və ailə xoşbəxtliyindən məhrum olmaq hesabına olsa belə, ümumi mənafe naminə çarpışırlar. Haqq işi uğrunda mübarizələrini vətəndaşlıq borcu hesab edirlər.

Bayatıların və atalar sözlərinin bir çoxu qəhrəmanlığa, igidliyə, mərdliyə, vətənpərvərliyə həsr olunub. Dərslikdə də bu səpgili bayatılara diqqət yetirilir: "Əziziyəm, dilən gəz, Dilən könlüm, dilən gəz! Qürbətdə xan olunca, Vətənində dilən gəz".

"Vətənin qədri qürbətdə bilinər" tipli atalar sözləri də vətəndaşlığın tərbiyə olunmasına imkan verir. Lakin, nədənsə, dərslikdə vətənpərvərliyə aid yalnız bir atalar sözü verilmişdir.

Vətənə məhəbbət, vətənin təəssübünü çəkmək, doğma yurda, onun maddi və mənəvi sərvətlərinə görə milli qürur və iftixar hissi keçirmək fəal vətəndaşlıq mövqeyidir.

"Qədim dövr Azərbaycan ədəbiyyatı" fəslində oxuyuruq: "I minilliyin sonu, II minilliyin əvvəlləri Azərbaycanda, bütövlükdə müsəlman dünyasında türk-oğuz xaqanlarının nüfuzu güclü idi. Onlar özlərini bütün müsəlmanların hökmdarı kimi aparır, saraylarında türkcə ilə yanaşı. farsca, ərəbcə yazan qüdrətli şairləri də himayə edirdilər. Məsələn, Türküstan xaqanlarından Sultan Mahmud Qəznəvi fars şairi Firdovsiyə türklərin tarixi qəhrəmanlığı barədə əsər yazmağı sifariş vermişdi. Lakin şair xaqanın himayəsində yaşasa da, verdiyi sözə əməl etməmiş, əsərini türklərin əleyhinə yazmışdır. Sultan məsələdən xəbər tutduqda sənətə hörmət naminə şairə toxunmamış, lakin vədə əməl etmədiyinə görə onu saraydan qovmuşdu" (1, 25).

Burada fars şairi Firdovsinin mövqeyini fəal vətəndaşlıq mövqeyi kimi deyil, millətçi mövqeyi kimi qiymətləndirmək olar. O, iki xalq – türk və fars xalqları arasında ədavət toxumu səpməyə doğru istiqamətləndirir. Şair siyasətin əsiri

olmamalı, yüksək mənəvi ideallların carçısı kimi diqqət mərkəzində dayanmalıdır.

"Qədim dövr Azərbaycan ədəbiyyatı" fəslində o dövrün digər şairləri kimi Əfzələddin Xaqaninin yaradıcılığı barədə məlumatın verilməsi nəzərdə tutulur.

Məlum olduğu kimi, Xaqani Şirvani yaradıcılığa başladığı ilk illərdə öz şeirlərində sarayı, xaqanları tərənnüm edirdi. Yaşının üstünə yaş gəldikcə cəmiyyətdəki ədalətsizliyin, zülmün, istismarın artdığını, buna isə hökmdarların bais olduğunu gördükdən sonra onları tənqid etməyə başladı və təqiblərə məruz qaldı, həbs edildi. Şirvanı tərk etmək məcburiyyətində qalaraq Təbrizə gəlir. Şirvanda olmazın əzab-əziyyət və məhrumiyyətlərlə qarşılaşmağına baxmayaraq, onun əleyhinə bir kəlmə belə danışmır, yazmır. Özünün fəal vətəndaşlıq mövqeyində axıra qədər sadiq qalır. Vətəni dərin məhəbbətlə yad edərək yazır:

Şamaxı! Ey mənim sevimli yurdum!

Mən sənin qoynunda xaniman qurdum (1, 27).

Dərslikdəki mövzulardan biri "Dədə Qorqud" eposu"dur. Eposda oğuzların islamı təbliğ etmək, yaymaq, doğma yurdu düşmənlərin hücumlarından müdafiə etmək, onlara layiqli cavab vermək istiqamətindəki fəaliyyəti diqqət mərkəzinə gətirilir. Dərslikdə deyildiyi kimi, "Dədə Qorqud" sözün geniş mənasında qəhrəmanlığı tərənnüm edir. Vətəni, dövləti, milli inamları, ailəni, adət-ənənələri qorumaq oğuz igidinin müqəddəs amalı, onun təmənnasız qəhrəmanlığının mənbəyi, əsasıdır" (1, 32).

"Şah İsmayıl Xətai" mövzusu da yuxarı sinif şagirdlərində fəal vətəndaşlıq mövqeyinin formalaşdırılması üçün imkanlar açır. Şairin yaradıcılığından danışılarkən aşağıdakı məsələlərin məktəblilərə çatdırılması məqsədəuyğun hesab edilir: "Hökmdar şiəliyi təbliğ etməklə, bir tərəfdən dövlət qurmaq, ikinci tərəfdən, qurduğu dövlətin siyasi-ideoloji əsaslarını möhkəmləndirmək, nəhayət, üçüncü tərəfdən. ölkəsinin əhalisini vahid bayraq və bir ideya ətrafında birləşdirmək istəyirdi. Belə ideya isə, Şah İsmayılın nəzərində qızılbaşlıq idi. Bu təriqət zülmə, əsarətə, ədalətsizliyə qarşı etiraz, haqqa, doğruluğa, bərabərliyə çağırış rəmzi kimi tərənnüm edilirdi" (1, 73).

Şah İsmayıl Xətai bir hökmdar olmaqdan savayı, fəal vətəndaş, böyük şəxsiyyət idi. Mərkəzləşdirilmiş dövlət yaratmışdı, Azərbaycan dilini dövlət dili elan etmişdi, yazışma, dinləmə Azərbaycan dilində idi. Şeirlərini Azərbaycan dilində yazırdı. Sarayda vəzifə başına azərbaycanlıları gətirmişdi.

X sinfin "Ədəbiyyat" dərsliyində özünə yer almış mövzulardan biri də "Koroğlu" eposudur. Koroğlu həqiqi vətəndaş – Vətən daşı idi. Haqq işi uğrunda mübarizə aparırdı, xalqın mənafeyindən çıxış edirdi. Onların müdafiəçisi və pənahı idi. Koroğlu da xalqdan ilham alırdı.

zXI siniflərin "Ədəbiyyat" dərsliyini də nəzərdən keçirdik. Dərslikdə öz ifadəsini tapmış belə bir fikir önəmlidir ki: ""Dədə Qorqud" eposu göstərdi ki, Azərbaycan ədəbiyyatı:

1) qədim türk ədəbiyyatının birbaşa varisi, türk tayfalarının dünyanın geniş bir coğrafiyasında min illər boyu yaratdıqları zəngin dünyagörüşünün

davamıdır;

2) son (və ən mükəmməl) ümumdünya dini olan islama, onun ideologiyasına əsaslanır;

3) nəhayət, ümumbəşəri ideya-estetik dəyərlərə dayanaraq müasir dünyanı dərk etməyə çağırır.

Azərbaycan ədəbiyyatı tarixinin müxtəlif dövrlərində, mərhələlərində bu istiqamətlərin (türkçülük, islamçılıq və müasirlik) birinin digərlərindən daha qabarıq, daha fəal olması həmin dövrün, mərhələnin ədəbi-ictimai maraqlarının ifadəsidir" (2, 3).

Bu fikirlər də məqalədə nəzərdən keçirdiyimiz problemlə sıx surətdə əlaqədardır. Məktəblilərdə fəal vətəndaşlıq mövqeyinin formalaşdırılması üçün imkanlar açır.

Azərbaycanın klassik və müasir yazıçı və şairləri qədim türk epos ənənələri, milli adət və ənənələrlə qırılmaz tellərlə bağlı olmaqla yanaşı ümumbəşəri ideyaları da yorulmadan təbliğ etmiş, onlardan faydalanmağı vacib hesab etmişlər.

Cəlil Məmmədquluzadənin XI sinif dərsliyinə daxil edilmiş "Anamın kitabı" tragikomediyası" mövzusu şagirdlərdə fəal vətəndaşlıq mövqeyinin formalaşdırılması baxımından zəngin material verir.

"Anamın kitabı" əsərində vətənsevərlik, azərbaycançılıq düşüncə tərzindən uzaq düşmüş qardaşlar tənqid olunur. Qardaşlardan Rüstəm bəy rus intelligenti geyimində və rus düşüncə tərzində; Mirzə Məhəmmədəli İran libasında, İran tərbiyəsi görmüş; Səməd Vahid – İstanbul tərbiyəsi tərəfdarıdır. Onlardan ötrü ana və Vətən kimi ülvi və müqəddəs anlayışlar öz məna və dəyərini itirib.

Dərslik müəllifləri yazırlar: "Əbdüləzim bəyin övladlarından yalnız Gülbahar ana vətənə, doğma xalqa sadiqdir. Qardaşlarını doğru yola, milli-mənəvi birliyə qovuşdurmaq yolundakı səyləri, pak və səmimi münasibətləri, təbii həyəcanları onun həqiqi bir vətənpərvər azərbaycanlı qızı olduğunu qəti olaraq təsdiqləyir. Gülbahar obrazı Azərbaycan ədəbiyyatında Vətən və millət, milli birlik və istiqlal amalının dramatik üverturasıdır" (2, 27).

Yazıçı Vətən, millət, xalq, milli birlik kimi vacib anlayışları Zəhrabəyim ananın, Gülbaharın, Zaman, Qənbər, Qurban və başqa bu kimi insanların vasitəsilə dəyərləndirilir.

Gülbahar atasının vəsiyyətini oxuyur: "Yer, göy, aylar və ulduzlar göylərdə seyr edib gəzə-gəzə genə əvvəl-axır günün başına dolanırlar. Mənim də balalarım dünyada hər yanı gəzib-dolansalar, genə əvvəl-axır onlar Zəhranın ətrafında gərək dolanalar. Çünki ay və ulduzlardır. Vay o kəsin halına ki, təbiətin həmin qanununu pozmaq istəyə. Onun insafı və vicdanı ona əziyyət edəcək, nə qədər canında nəfəs var, peşiman olacaq" (2, 27).

Nəzərdən keçirdiyimiz problem baxımından M.Ə. Sabirin XI sinfin dərsliyindəki "Amalımız, əfkarımız ifnayi-Vətəndir" satirası və "Səttarxana" şeiri"; C. Cabbarlının "Oqtay Eloğlu" pyesi; S. Vurğunun "Azərbaycan" şeiri, M.Şəhriyarın "Heydərbabaya salam" poeması; Mir Cəlalın "Bir gəncin manifesti" romanı; B. Vahabzadənin "Yaradıcılığı" və "Gülüstan" poeması mövzuları daha səciyyəvidir.

"Amalımız, əfkarımız ifnayi-Vətəndir" satirasında millətin dirçəlişini və Vətənin tərəqqisini şübhə altına alanlar tənqid olunur. Bu satira imkan verir ki, XI sinif

şagirdlərində öz vətəndaşlıq borclarını dərk etməyənlər, hüquq və davranış qaydalarını pozanlar, özləri üçün yaşayanlar, xalq və doğma yurd barədə düşünməyənlər barədə aydın təsəvvürə yiyələnsinlər. Məktəblilər öyrənirlər ki, hələ ötən əsrin əvvəllərində elə şəxslər vardı ki, Avropa ölkələri, dünya xalqları daim tərəqqi etdikləri halda, bu adamlar irəliləyişimizə maneçilik törədirdilər, millətin maariflənməsini istəmirdilər:

*Biz xoşlamırıq dərsi ki, min məktəb açılsın,*

*Gər min də məarif sözü dünyaya saçılsın (2, 38).*

Dərsliyə salınmış "Səttarxan" şeirində M.Ə. Sabir həqiqi vətənpərvərin, əsl vətəndaşın – Səttarxanın obrazını yaratmışdır. İran istibdadına qarşı mübarizəyə qalxan, kütlələri ardınca aparan Səttarxan xalq qəhrəmanı, tarixi şəxsiyyət səviyyəsinə yüksəlmişdir. Bir əsrdən çox vaxt keçsə də, onun adı dillərdə dastandır, tarixin səhifələrində yaşayır.

Dərslikdə "Səttarxan" şeirinin təhlili zamanı belə önəmli məlumata diqqət yetirlir: "Səttarxan 1906-1911-ci illərdə Cənubi Azərbaycanda milli azadlıq hərəkatına, demokratik proseslərə uğurla başçılıq etmişdir. 1908-ci ildə Təbrizə yeridilmiş şah qoşunları Səttarxanın başçılığı ilə darmadağın edilmişdir (2, 40).

Bütün bunlar, bu və buna bənzər məlumatlar şagirdlərdə fəal vətəndaşlıq mövqeyinin formalaşdırılması baxımından tutarlı mənbələr hesab oluna bilər.

Möhkəm əqidə sahibi, həqiqi vətəndaş, millət, xalq, Vətən təəssübü çəkən, milli teatrın yaradılması yolunda min bir əziyyətə tablaşan Oqtay Eloğlunun (C.Cabbarlı. "Oqtay Eloğlu" pyesi) fəaliyyəti; sadə bir azərbaycanlı qadını Sonanın (Mir Cəlal. "Bir gəncin manifesti" romanı) ehtiyacı olduğu halda varlı-karlı ingilisin ona təklif etdiyi xeyli məbləğ puldan imtina edərək "İtə ataram, yada satmaram!" deyərək xalçanı bükərək götürməsi əsl vətəndaşlıq mövqeyidir.

Bəxtiyar Vahabzadənin dərsliyə daxil edilmiş "Gülüstan" poemasının tədrisinə həsr olunmuş mövzu xüsusilə diqqətəlayiqdir. Məlum olduğu kimi, Azərbaycanımızın bölünməsinin təməli 1813-cü il noyabrın 5-də İran və Rusiya arasında bağlanmış müqavilə əsasında qoyulmuşdur. Bəxtiyar Vahabzadə sovet rejiminin tüğyan etdiyi illərdə qorxmadan, çəkinmədən "Gülüstan" poemasını yazaraq tarixi həqiqəti ortaya qoydu. Sovet imperiyasına və İran monarxiyasına qarşı çıxdı. B. Vahabzadə həbs olunmasa da, millətçi kimi damğalanaraq üzərinə nəzarət qoyuldu.

Poema ilə tanışlıqdan belə bir qənaətə gəlmək olur ki, sözdə, dildə deyil, lazım gəldiyi, zəruri ehtiyac yarandığı hallarda həqiqi vətənpərvərlik, əsl vətəndaş mövqeyi göstərmək lazımdır.

Vətən, ana dili mövzusu Bəxtiyar Vahabzadənin bütün yaradıcılığını qırmızı xətlə kəsib keçir. Həm də bu mövzular yaradıcılığa başladığı ilk günlərdən, aylardan şairi düşündürmüşdür. B. Vahabzadənin "Vətən var", "Şəhidlər", "Şəhid məzarları", "Bəsdir", "Təyyarələr" və başqa şeirləri vətənpərvərliklə bağlıdır.

"Ana dili", "Latın dili", "Cavab" və digər şeirlərində Azərbaycan dilinin taleyi üçün narahatlıq hiss olunur. Sovet İttifaqına daxil olduğumuz illərdə imperiya milli dillərin inkişafına mane olur, fəal işlədilməsinə imkan vermirdi. Dövlət, hökumət, partiya orqanlarında,

orduda sənədləşmə və ünsiyyət rus dilində idi.

Dərslikdə oxuyuruq: "Şair yaxşı bilirdi ki, insanın vətən, yurd hissi onun ana dilinə ayrılmaz şəkildə bağlıdır: insanlar öz doğma dillərini itirəndən sonra onlarda həqiqi vətən hissi mümkün deyil" (2, 167).

Beləliklə, deyilənlərdən belə bir qənaətə gəlmək olar ki, X-XI siniflərin ədəbiyyat dərslikləri yuxarı sinif şagirdlərində fəal vətəndaşlıq mövqeyinin formalaşdırılması baxımından zəruri material verir. Müəllim həmin materialların təhsilləndirici, tərbiyələndirici və inkişafetdirici imkanlarından faydalanmaqla səmərəli nəticələrə nail ola bilər.

### ƏDƏBİYYAT

1. *Cəfərov.N., Kərimli.T., Əsgərli.Z., Bakıxanova.A. Ədəbiyyat: Ümumtəhsil məktəblərinin 10-cu sinfi üçün dərslik. Bakı; Çaşıoğlu, 2012.*

2. *Cəfərov.N., Həbibbəyli.İ., Əliyeva.N., Bakıxanova.A. Ədəbiyyat: Ümumtəhsil məktəblərinin 11-ci sinfi üçün dərslik. Bakı; Çaşıoğlu, 2010.*

### РЕЗЮМЕ
### ФОРМИРОВАНИЕ АКТИВНОЙ ГРАЖДАНСКОЙ ПОЗИЦИИ У УЧЕНИКОВ X-XI КЛАССОВ: АНАЛИЗ ШКОЛЬНЫХ УЧЕБНИКОВ ПО ЛИТЕРАТУРЕ

*В статье исследуются возможности нижеперечисленных тем, включенных в учебники для X-XI классов с точки зрения формирования у старшеклассников активной гражданской позиции. Темы, включенные в учебник для X класса «Устное народной творчество Азербайджана», эпос «Деде Коркут», «Литература Азербайджана древнего периода», «Шах Исмаил Хатаи»; эпос «Кероглу»; и произведения включенные в учебник для XI класса трагикомедия Дж. Мамедгулизаде «Книга моей матери»; стихотворение М.А. Сабира «Саттархан»; пьеса Дж. Джаббарлы «Октай Эльоглу»; стихотворение С. Вургуна «Азербайджан»; творчество М. Шахрияра и поэма «Гейдар баба»; роман Мир Джалала, «Манифест молодого человека»; творчество Б. Вагабзаде и поэма «Гюлистан».*

### SUMMARY
### ACTIVE CITIZENSHIP IN STUDENTS X-XI CLASSES: ANALYSIS OF SCHOOL LITERATURE TEXTBOOK

*The article explores the possibility of the following topics included in textbooks for the X-XI classes in terms of the formation of high school students active citizenship. The topics included in the textbook for class X "oral folklore of Azerbaijan", the epic "Dede Korkut", "Azerbaijan Literature of Ancient Period", "Shah Ismail Khatai"; epos "Koroghlu"; and the works included in the textbook for 10 Class J. Mamedgulizade's tragicomedy "The Book of My Mother."; M.A. Sabir's poem "Sattarkhan"; J. Jabbarly's play "Oktay Eloghlu."; S. Vurgun's poem "Azerbaijan"; M. Shahriyar's "Creation" and poem "Heydar Baba"; Mir Jalal's novel "The Young Man's Manifesto"; B. Vahabzadeh's "Creation" and poem "Gulustan".*

# TABELİ MÜRƏKKƏB CÜMLƏLƏRDƏ PROBLEMLİ MƏSƏLƏLƏR

**Məmmədxan SOLTANOV,**
**filologiya elmləri üzrə fəlsəfə doktoru,**
**Aygün HƏSƏNOVA,**
**Bakı şəhərindəki 18 nömrəli orta məktəbin müəllimi**

***Açar sözlər:*** *onomastika, toponim, etimologiya*
***Ключевые словы:*** *ономастика, топоним, этимология*
***Key words:*** *onomastika, toponim, etymology*

Sintaksisin nisbətən çətin mənimsənilən bəhslərindən biri tabeli mürəkkəb cümlələrdir. Tabesiz mürəkkəb cümlələr bərabərhüquqlu sadə cümlələrdən ibarət olur və bu sadə cümlələr bir-birindən asılı olmayıb, tabesizlik əlaqəsi ilə bağlanır. Tabeli mürəkkəb cümlələrdə isə sadə cümlələrdən biri qrammatik cəhətdən müstəqil, digəri ondan asılı olur, asılı cümlə bu və ya digər cəhətdən müstəqil cümləni izah edir. Belə mürəkkəb cümlələrdə tabe edən hissə baş cümlə, tabe olan hissə isə budaq cümlə adlanır.

Tabeli mürəkkəb cümlənin tərkib hissəsi olan budaq cümlələr ya baş cümlənin buraxılmış bir üzvü yerində işlənir, ya baş cümlənin əvəzliklə ifadə olunmuş bir üzvünü izah edir, ya da bütövlükdə baş cümlənin məzmunu ilə bağlı olur. Məsələn, "Aydın idi ki, onun bu işdən xəbəri yoxdur" cümləsində budaq cümlə (onun bu işdən xəbəri yoxdur) baş cümlənin (aydın idi) buraxılmış mübtədasının yerində işlənmişdir. "Kim yaxşı oxuyursa, onu mükafatlandırırlar" cümləsində budaq cümlə (kim yaxşı oxuyursa) baş cümlənin (onu mükafatlandırırlar) onu əvəzliyi ilə ifadə olunmuş tamamlığını izah edir. "Müəllim öz kəndimizdən olsa, işlərimiz qaydasına düşər" cümləsində isə budaq cümlə (müəllim öz kəndimizdən olsa) baş cümlənin (işlərimiz qaydasına düşər) ümumi məzmunu ilə bağlı olub, baş cümlədəki işin şərtini bildirir.

Şagirdlərə tabeli mürəkkəb cümlələri öyrədərkən aşağıdakı problemli məsələləri nəzərə almaq lazımdır:

1. Şagirdlər mürəkkəblik anlayışını dərindən dərk etməlidirlər.
2. Tabeli mürəkkəb cümlələr içərisində feli sifət, feli bağlama və məsdər tərkibləri, cümlə şəkilli ara sözlər olan sadə cümlələrlə qarışdırılmamalıdır.
3. Tabeli mürəkkəb cümlədə baş və budaq cümlənin yeri dəqiq müəyyən edilməlidir.
4. Budaq cümlələrin növləri qarışdırılmamalıdır.
5. Tabeli mürəkkəb cümlələrdə durğu işarələrinin işlənməsinə ayrıca diqqət yetirilməlidir.
6. Növü orta məktəb proqramından kənara çıxan budaq cümlə növləri də müəyyən dərəcədə araşdırılmalıdır.

İlk növbədə şagirdlər bilməlidirlər ki, tabeli mürəkkəb cümlə ayrı-ayrı cümlələrin sadəcə olaraq birləşməsindən ibarət deyil. Sadə cümlələr yalnız məna, forma və intonasiyaya görə birləşib yeni sintaktik vahid yaratdıqdan sonra mürəkkəb cümləyə çevrilir. Çünki sadə cümlələr yalnız bu birləşmə halında müəyyən fikrin ifadəsinə xidmət edir.

Adətən, şagirdlər mürəkkəb cümlələri,

eləcə də tabeli mürəkkəb cümlələri iki və daha artıq qrammatik əsası olan cümlələr kimi qəbul edirlər. Bu halda tərkib hissələrinin mübtədası müştərək olan tabeli mürəkkəb cümlələr şagirdlər üçün müəyyən çətinlik törədir. Belə ki, onlar "Sən oxuyarsan, öyrənərsən" cümləsi ilə "Sən oxusan, öyrənərsən" cümləsi arasında fərq görmür, hər iki cümləni sadə cümlə kimi qəbul edirlər. Halbuki "Sən oxuyarsan, öyrənərsən" cümləsi sadə, "Sən oxusan, öyrənərsən" cümləsi isə tabeli mürəkkəb cümlədir. Bunları ayırmaq üçün şagird həm həmcins üzvlər, həm feilin şərt şəkli haqqında nəzəri məlumata malik olmalı və intonasiya cəhətdən verilmiş cümlələri fərqləndirməyi bacarmalıdır. Əlavə olaraq müəllim şagirdlərə çatdırmalıdır ki, "Sən oxuyarsan, öyrənərsən" cümləsindəki sözlər (xəbərlər) arasında və bağlayıcısını işlətmək mümkün olduğu halda, "Sən oxusan, öyrənərsən" cümləsində bunu etmək mümkün deyildir. Bundan başqa, ikinci cümlənin tərkib hissəsi olan xəbərlər də eyni formada olmayıb, eyni suala cavab vermir.

Tabeli mürəkkəb cümlələri sadə cümlələrlə eyniləşdirən bir xüsusiyyət də qarşılaşdırma budaq cümləli tabeli mürəkkəb cümlələrdə qarşılaşdırma tabesizlik bağlayıcılarının (amma, ancaq, lakin və s.) işlənməsi və ortaq mübtədanın işlənə bilməsidir. Məsələn, "Mən qapını itələdim, amma aça bilmədim" sadə cümləsi ilə "Doğrudur (düzdür), mən qapını itələdim, amma aça bilmədim" qarşılaşdırma budaq cümləli tabeli mürəkkəb cümlə arasında həm forma, həm də məzmun yaxınlığı göz qabağındadır. Lakin göründüyü kimi, bunlar müxtəlif sintaktik quruluşlu cümlələrdir və bu fərqi yaradan ikinci cümlədə budaq cümlədə işlənən "doğrudur" ("düzdür") sözüdür.

İçərisində feli sifət, feli bağlama və məsdər tərkibləri olan sadə cümlələr formal əlamətinə görə bəzən mürəkkəb cümləyə bənzədilir, daha dəqiq desək, bəzən feli tərkiblər tabeli mürəkkəb cümlənin budaq cümələri ilə eyniləşdirilir. Bu oxşarlıq təbiidir, çünki sadə cümlənin içərisində işlənən feli tərkiblərin müəyyən qismi istənilən vaxt tabeli mürəkkəb cümlənin budaq cümləsinə çevrilə bilir. Məsələn, "Biz kəndə çatanda yağış yağmağa başladı" sadə cümləsindəki "biz kəndə çatanda" feli bağlama tərkibini tabeli mürəkkəb cümlənin zaman budaq cümləsi kimi işlətsək, "Biz kəndə çatmışdıq ki, yağış yağmağa başladı" cümləsi alınar. Eləcə də "Mən buraya məhsul yığımına nəzarət etməyə gəlmişəm" sadə cümləsindəki "məhsul yığımına nəzarət etməyə" məsdər tərkibini tabeli mürəkkəb cümlənin məqsəd zərfliyi kimi işlətsək, "Mən buraya gəlmişəm ki, məhsul yığımına nəzarət edim" cümləsi yaranır.

Deməli, içərisində feli sifət, feli bağlama və məsdər tərkibləri olan sadə cümlələr formal əlamətinə görə mürəkkəb cümləyə çox oxşayır. Lakin bu zahiri oxşarlıq sadə cümlədə işlənən tərkiblərlə mürəkkəb cümlənin tərkib hissəsi olan budaq cümləri bir-biri ilə qarışdırmağa əsas vermir. Birincisi, ona görə ki, feli sifət, feli bağlama və məsdər tərkiblərindəki feli sifət, feli bağlama və məsdər sadə cümlənin tərkibində xəbər kimi formalaşmır və mübtədanın icra etdiyi işi bildirmir və ya ona aid heç bir hökmü ifadə etmir. Tabeli mürəkkəb cümlənin budaq cümləsinin xəbəri isə tam şəkildə formalaşır. İkincisi, tabeli mürəkkəb cümlədə budaq cümlə baş cümləyə bağlayıcı və ya bağlayıcı sözlərlə, eləcə də şəkilçilərlə bağlanır. İçərisində feli sifət, feli bağlama və məsdər tərkibləri olan sadə cümlələrdə isə belə bir xüsusiyyət özünü göstərmir.

Tərkibində cümlə şəkilli ara söz olan

sadə cümlələr də ilk baxışda tabeli mürəkkəb cümlə kimi nəzərə çarpır. Bu formal oxşarliğin səbəbi odur ki, əslində belə cümlələr genetik cəhətdən tabeli mürəkkəb cümlənin tərkib hissələri olmuş, zaman keçdikcə transformasiya nəticəsində tədricən sadə cümlələrə çevrilmişdir. Məsələn, "İndi mənə elə gəlir ki, sənin dediyin bu iş heç vaxt baş tutmayacaq" cümləsi formal cəhətdən bütün komponentlərinə görə tabeli mürəkkəb cümləyə oxşayır.

Lakin bu, yalnız zahiri oxşarlıqdır və cümlənin məzmun cəhətinə diqqət yetirsək, görərik ki, onu tabeli mürəkkəb cümlə kimi götürməyə heç bir əsas yoxdur. Fikrimizi aşağıdakı kimi əsaslandıra bilərik:

1. Tərkibində cümlə şəkilli ara söz olan sadə cümlədə ara söz nisbətən müstəqillik təşkil edir və cümlədə ifadə olunan fikirlə yalnız münasibət cəhətdən bağlı olur. Məsələn, "Mənə elə gəlir ki, növbəti semestr imtahanları daha yüksək səviyyədə keçəcəkdir" cümləsində ara sözü ("mənə elə gəlir ki") cümlədən çıxarsaq, cümlənin nə mənasına, nə də quruluşuna xələl gəlməyəcəkdir. Çünki cümlə şəkilli həmin ara söz danışanın öz fikrinə münasibətini bildirmək məqsədi ilə işlədilmişdir və belə ara sözlər işləndikləri cümlələrə qrammatik cəhətdən təsir göstərə bilmir.

2. Cümlə şəkilli ara söz sadə cümlədəki obyektiv məzmunla danışanın subyektiv münasibətini göstərir. Mürəkkəb cümlənin tərkib hissələrindən hər biri isə cümlədə ifadə edilən fikrin müəyyən cəhətini əks etdirir. Başqa sözlə desək, cümlə şəkilli ara söz ekspressiv və emosional funksiyalar daşıdığı halda, mürəkkəb cümlənin tərkib hissələri kommunikativ vəzifə daşıyır.

3. Sadə cümlədəki cümlə şəkilli ara söz mürəkkəb cümlənin tərkib hissələrindən məna və vəzifəsinə görə fərqləndiyi kimi, intonasiyasına görə də fərqlənir.

4. Sadə cümlənin tərkibində müstəqil cümləyə bənzəyən cümlə şəkilli ara sözləri müvafiq sinonimlərlə, mənaca yaxın digər ara sözlərlə əvəz etmək olur və bu zaman cümlənin ümumi məzmununda heç bir dəyişiklik baş vermir. Məsələn, "Mənə elə gəlir ki, onun ən müsbət cəhəti nikbin olmasıdır" cümləsindəki cümlə şəkilli ara sözü ("mənə elə gəlir ki") "məncə", "fikrimcə", "zənnimcə" ara sözləri ilə əvəz etsək, cümlədə ifadə edilən fikrin mənasına heç bir xələl gəlməyəcəkdir.

5. Cümlə şəkilli ara söz işlənən sadə cümlələrdə istənilən vaxt ara sözü cümlənin orta hissəsinə salmaq olur. Halbuki tabeli mürəkkəb cümlələrdə bunu nadir hallarda etmək mümkündür. Məsələn, "Ola bilsin ki, bu gün-sabah ciddi bir dəyişiklik baş versin" cümləsindəki cümlə şəkilli ara sözün ("ola bilsin ki") yerini dəyişib onu cümlənin orta hissəsinə də salmaq olar: "Bu gün-sabah, ola bilsin ki, ciddi bir dəyişiklik baş versin".

Tabeli mürəkkəb cümlələrlə daha çox qarışdırılan cümlə şəkilli ara söz işlənən sadə cümlələrdə daha çox "mənə elə gəlir ki", "ola bilsin ki", "qəribədir ki", "görünür ki", demək olar ki" və s. kimi ara sözlər işlənir.

Tabeli mürəkkəb cümlələrdə problem yaradan məsələlərdən biri baş və budaq cümlənin yerinin dəqiq müəyyənləşdirilməsidir. Çünki budaq cümlənin növünü müəyyənləşdirmək üçün baş cümləni tapmaq vacib şərtlərdəndir və budaq cümlənin növünü məhz baş cümlənin içərisindən doğan sualla müəyyənləşdirmək olur.

Tabeli mürəkkəb cümlələrdə baş və budaq cümlənin yerini dəqiq müəyyənləşdirmək üçün məzmun əsas götürülsə də, qrammatik meyar kimi baş və budaq cümlələri bağlayan vasitələri bilməyin də çox böyük əhəmiyyəti vardır.

Tabeli mürəkkəb cümlələrdə budaq cümlələri baş cümləyə bağlayan vasitələr aşağıdakılardır:

1. Budaq cümlələrin bir qismi baş cümləyə tabelilik bağlayıcıları (ki, çünki, ona görə ki, əgər, hərgah, madam ki və s.) ilə bağlanır. Məsələn: "Ağlına da gətirməzdi ki, onu burada görəcək". "Əgər gəlib çıxmasa, onu çox gözləmə".

Belə budaq cümlələr baş cümlədən əvvəl də, sonra da işlənə bilər.

Səbəb bağlayıcısı ilə əmələ gələn tabeli mürəkkəb cümlələrdə əvvəl baş cümlə, sonra budaq cümlə, şərt və güzəşt bağlayıcıları ilə əmələ gələn tabeli mürəkkəb cümlələrdə isə əvvəl budaq cümlə, sonra baş cümlə gəlir.

Tabeli mürəkkəb cümlələrin böyük bir qismində budaq cümlə baş cümləyə "ki" bağlayıcısı ilə bağlanır. Belə cümlələrdə əksərən əvvəl baş cümlə, ondan sonra isə budaq cümlə gəlir. Yalnız zaman budaq cümləli tabeli mürəkkəb cümlələrdə baş və budaq cümlə yerini dəyişir, budaq cümlə əvvəl, baş cümlə sonra işlənir. Məsələn: "Universitetə çatmağa az qalmışdım ki, zəng vuruldu".

2. Budaq cümlələr baş cümləyə yalnız intonasiya ilə bağlanır. Məsələn: "Bilirəm, burada yox idin". "Arif gördü, yox, məsələ qəlizdir" və s.

Belə budaq cümlələr əksərən baş cümlədən sonra gəlir.

3. Budaq cümlələrin bir qrupu baş cümləyə kim, nə, necə, hansı, nə vaxt, hara, nə qədər və s. əvəzliklərlə (bağlayıcı sözlərlə) bağlanır. Bu bağlayıcı sözlər çox vaxt ki ədatı ilə birgə işlənir: kim ki, necə ki, hansı ki və s. Məsələn: "Kim ki çox çalışır, daha çox qazanmalıdır". "Necə demişdiniz, elə də yazmışam".

Belə budaq cümlələr, bir qayda olaraq, baş cümlədən əvvəl gəlir.

4. Budaq cümlə baş cümləyə -sa(-sə) şəkilçisi və -mı(-mi,-mu,-mü) ədatı ilə də bağlanır. Belə budaq cümlələr də baş cümlədən əvvəl gəlir. Məsələn: "Atan gəlsə, mənə xəbər ver". "Zəng vuruldumu, özünü mənə çatdır".

5. Budaq cümlə baş cümləyə "doğrudur", "düzdür" ara sözləri və "hərçənd", "hərçənd ki" güzəşt bağlayıcıları və qarşılıqlı şəkildə işlənən "amma", "ancaq", "lakin" və s. qarşılaşdırma tabesizlik bağlayıcıları ilə bağlanır. Müvafiq şəkildə "doğrudur", "düzdür" ara sözləri və "hərçənd", "hərçənd ki" güzəşt bağlayıcıları budaq cümlənin, "amma", "ancaq", "lakin" və s. qarşılaşdırma tabesizlik bağlayıcıları isə baş cümlənin tərkibində işlənir. Belə tabeli mürəkkəb cümlələrdə budaq cümlə əvvəl, baş cümlə ondan sonra işlənir.

Bəzən tabeli mürəkkəb cümlələrdə elə forma dəyişiklikləri baş verir ki, baş və budaq cümlə bir növ tamamilə qarışır və onların sərhədini müəyyənləşdirmək çətinləşir. Məsələn, "Məlik hər gün çimdiyi, kənarında uzanıb dincəldiyi gölü ilk dəfə idi ki, belə görürdü" cümləsi əslində mübtəda budaq cümləli tabeli mürəkkəb cümlədir. Burada "İlk dəfə idi" baş cümlə, "Məlik hər gün çimdiyi, kənarında uzanıb dincəldiyi gölü belə görürdü" isə budaq cümlədir. Baş cümlə budaq cümlənin arasına girmiş, baş və budaq cümlənin sərhədi dəyişmişdir ki, bu da, əlbəttə, baş və budaq cümləni müəyyənləşdirməkdə şagirdlər üçün çətinlik törədir.

Deməli, baş və budaq cümləni müəyyən etməkdə budaq cümlələrin tabeli mürəkkəb cümlədə işlənmə yerini bilməyin mühüm əhəmiyyəti vardır və bütün deyilənlər əsasında tabeli mürəkkəb cümlələrdə baş və budaq cümlənin yerini dəqiq müəyyənləşdirmək olar ki, bu da budaq cümlənin növünün müəyyən edilməsində əhəmiyyətli rol oynayır.

Tabeli mürəkkəb cümlələrin tədrisində qarşıya çıxan bir çətinlik də budaq cümlənin növünün dəqiq müəyyənləşdirilməsidir. Elmi-metodik ədəbiyyatda qeyd edildiyi kimi, budaq cümlələrinin, demək olar ki, əksəriyyəti forma etibarilə bir-birinə oxşayır və buna görə də zahiri cəhəti əsas götürüb budaq cümlələrin növünü müəyyənləşdirmək çətin olur. Çünki budaq cümləni yeni öyrənən şagird hələ onun özünəməxsus məna incəliyini seçə bilmir və müəyyən forma oxşayışına tez aldanır.

Budaq cümlə növlərindən səbəb və məqsəd budaq cümlələri də bir-birinə çox yaxındır. Lakin onların bir-birindən fərqli cəhətləri vardır. Bu budaq cümlələri fərqləndirmək üçün aşağıdakıları bilmək lazımdır:

1) Səbəb budaq cümləsi səbəb, məqsəd budaq cümləsi məqsəd bildirir. Səbəb budaq cümləsi nə səbəbə? sualına, məqsəd budaq cümləsi isə nə məqsədlə? sualına cavab verir. Məsələn: "Ona görə qaçırdım ki, işə gecikirdim" (nə səbəbə?). "Ona görə qaçırdım ki, işə vaxtında çatım" (nə məqsədlə?).

2) Səbəb budaq cümləsinin ifadə etdiyi iş baş cümlədəki işdən əvvələ, məqsəd budaq cümləsinin ifadə etdiyi iş isə baş cümlədəki işdən sonraya aid olur.

3) Səbəb budaq cümləsinin xəbəri əksərən feilin xəbər şəklində, məqsəd budaq cümləsinin xəbəri isə əmr və ya arzu şəkillərində olur.

4) Səbəb budaq cümləsi qoşmalı feli sifət tərkibi, məqsəd budaq cümləsi isə qoşmalı məsdər tərkibi şəklində sadələşir. Verdiyimiz səbəb və məqsəd budaq cümləli tabeli mürəkkəb cümlələri sadələşdirsək aşağıdakı cümlələr alınar: "İşə gecikdiyimə görə qaçırdım" və "İşə gecikməmək üçün qaçırdım".

Tabeli mürəkkəb cümlələrin böyük bir qismində budaq cümlə baş cümləyə yalnız intonasiya ilə bağlanır. Məsələn: Dedim gedib kitabı gətirsin. Gördüm gəlir və s.

Belə tabeli mürəkkəb cümlələr əslində baş və budaq cümləni bağlayan ki bağlayıcısının ixtisara düşməsi ilə yaranır və bu cümlələrdə çox zaman intonasiya ilə bağlı olaraq heç bir durğu işarəsindən istifadə edilmir. Məsələn, qeyd etdiyimiz cümlələrin hər ikisi intonasiya ilə yaranan tamamlıq budaq cümləli tabeli mürəkkəb cümlədir və bu cümlələrdə baş və budaq cümləni ayırmaq üçün vergül işarəsinə ehtiyac yoxdur. Lakin məna cəhətini nəzərə alsaq, cümlədə vergül işarəsini işlətmək də olar və bu heç bir qarışıqlıq yaratmaz.

Lakin bəzən elə tabeli mürəkkəb cümlələrə də rast gəlmək olur ki, baş və budaq cümlə arasında vergül işlənmir və məna cəhətinə görə işlənməsi də mümkün deyildir. Belə cümlələrdə vergülün işlənməsi məna fərqinə gətirib çıxarır. Məsələn, "Demə Səməd Vurğun gəldi-gedərdi" cümləsi tamamlıq budaq cümləli tabeli mürəkkəb cümlədir. Bu cümlədə "demə" sözündən sonra vergülün işlənməsi mənanı tamam dəyişir və həmin cümlə ara sözlü sadə cümləyə çevrilir.

Bəzən elə budaq cümlə növlərinə rast gəlinir ki, bu budaq cümlə növləri orta məktəb proqramına daxil edilməmişdir. İmkan daxilində müəllim belə budaq cümlə növləri haqqında da şagirdlərə məlumat verməlidir. Məsələn, Nəticə budaq cümləsi müəyyən xüsusiyyətlərinə görə səbəb budaq cümləsinə oxşayır. Çünki bu budaq cümlə növlərinin hər ikisi çox vaxt "ki" bağlayıcısı ilə əmələ gəlir, hər ikisi baş cümlədən sonra işlənir. Lakin nəticə budaq cümləsi səbəb budaq cümləsinə bənzəsə də, müəyyən cəhətlərinə görə ondan fərqlənir. Əvvəla, səbəb budaq cümləsi baş cümlədən çıxan niyə? nə səbəbə? suallarına cavab verir,

nəticə budaq cümləsində isə baş cümlənin özü sual şəklində meydana çıxır. Məsələn, "Mən xoşbəxtəm ki, azad və müstəqil Azərbaycan Respublikasında yaşayıram" tabeli mürəkkəb cümləsində budaq cümlə baş cümlədən doğan niyə? sualına cavab verir, "Bu qədər pulu kim apardı ki, görən olmadı" tabeli mürəkkəb cümləsində isə baş cümlənin özü sual şəklində cavab tələb edir. İkincisi, səbəb budaq cümləli tabeli mürəkkəb cümlələri sadələşdirəndə budaq cümlə feli sifət tərkibi şəklində baş cümlənin səbəb zərfliyi yerində işlənir. Məsələn: "Mən azad və müstəqil Azərbaycan Respublikasında yaşadığıma görə xoşbəxtəm". Nəticə budaq cümləli tabeli mürəkkəb cümlələrdə isə budaq cümlə, bir növ, sual şəklində meydana çıxan baş cümlənin nəticəsi kimi səslənir və belə cümlələri sadələşdirmək olmur. Məsələn: "Mənim gücüm haradadır ki, onun kimi əjdahanın qabağına çıxım".

### *ƏDƏBİYYAT*


*1. Abdullayev A., Orta məktəbdə Azərbaycan dilinin tədrisi metodikası. Bakı: "Maarif" nəşriyyatı, 1968.*

*2. Abdullayev Ə., Yusifov Y., Həsənov A., Müasir Azərbaycan dili (sintaksis). IV hissə. Bakı: "Maarif" nəşriyyatı, 1985.*

*3. Abdullayev Ə., Sintaksisin aktual məsələləri (tabeli mürəkkəb cümlənin tədqiqi). Bakı: ADU-nun nəşri, 1987.*

*4. Abdullayev K., Azərbaycan dili sintaksisinin nəzəri problemləri. Bakı: "Maarif" nəşriyyatı, 1998.*

*5. Azərbaycan dilinin sintaksisinə dair tədqiqlər. Bakı: Azərb.SSR EA nəşri. 1963.*

*6. Balıyev H., Müasir Azərbaycan ədəbi dilindən sintaksis bəhsi üzrə metodik göstəriş. Bakı: 1967.*

*7. Həsənov M. Durğu işarələrinin təlimi metodikası (metodik göstəriş). Bakı. APİ-nin nəşri, 1974.*

*8. Kazımov Q., Dildən xüsusi seminar. Bakı. APİ-nin nəşri. 1975.*

*9. Kazımov Q., Müasir Azərbaycan dili (sintaksis). Bakı. "Aspoliqraf LTD" MMC-nin mətbəəsi, 2004.*

*10. Rəhimov A., Azərbaycan dilindən sintaksisin tədrisinin nəzəri və praktiki əsasları. Bakı: "Mütərcim" nəşriyyatı, 1996.*



### *РЕЗЮМЕ*

**_Проблемные вопросы сложных предложений_**

*Одним из сложных вопросов подчиненных сложных предложений, чем синтаксис. Один из простых предложений и грамматически сложные предложения независимо друг от друга, а другой зависит от него, независимо от приговора или другого независимого приговора говорит. Который является частью предложения или основной ветви сложных предложений выдается предложение, обрабатываемых в качестве члена или члена вашей головы, он объясняет əvəzliklə приговор или вся голова связана с содержанием предложения. Эта статья о проблемных вопросах, возникающих в сложных предложениях, от расследуется.*



### *SUMMARY*

**_Problematic issues of complex sentences_**

*One of the difficult subjects subordinate complex sentences than syntax. One simple sentences and grammatically complex sentences independently, and the other depends on it, regardless of the sentence or other independent sentence is telling. Which is part of the sentence or the main branch of complex sentences issued the sentence being processed at a member or a member of your head, he explains əvəzliklə sentence or a whole head is related to the content of the sentence. This article is about the problematic issues encountered in complex sentences, from being investigated.*

# XALQ YAZIÇISI İLYAS ƏFƏNDİYEVİ DÜŞÜNƏRKƏN...

**Qənirə ƏMİRCANOVA,**
**pedaqogika üzrə fəlsəfə doktoru, əməkdar müəllim**

***Onun ölümündən 20 il keçir. 20 bahar, 20 payızdır ki, aramızda deyil, əbədi dünyanın sakinidir. Gəlişi nə qədər sevincli idisə, yoxluğu bir o qədər qüssəli və kədərlidir...***

Mən xalq yazıçısı İlyas Əfəndiyevi çox sevdim. Günlər keçdikcə yol yoldaşım, həyatda tək amalım oldu mənim. Onun yaradıcılığını tədqiq etdiyim üçün qürur duydum. Sən demə, o, təpədən-dırnağa mənəmmiş. Mənim düşüncəm duyğularım, mənim sevgim və nifrətim... Dili o qədər təbii, o qədər zəngin ki, əsərlərində dilimi yenidən sevdim, millətimlə fəxr elədim.

Həyata daha çox bağladı məni. Kədərə boyun əymədim, yoxluğu ilə barışmadım... Varlığına daha çox inandım. İnandım ki, əsərləri haqqında düşünə-düşünə, hadisələri tədqiq etdikcə xəyalən onun qəhrəmanlarına çevrildim, düşüncəmdəki xeyirlə şər onun mənfi və müsbət qəhrəmanlarına döndü. Dünyanın labirintində nəyin yaxşı, nəyin pis, nəyin haqlı və haqsız, nəyin çirkin və gözəl olduğunu öyrəndim. Xeyirxahlığı əməllərində hamıya ünvanladım. Pislikləri gömdüm dərin və sonu görünməyən quyularda...

Elə hey onun haqqında düşünüb-daşındım: Görər sən, düşüncələrini bütünlüklə sözə çevirə bildimi? Qəlbindəkiləri axıradək söyləyə bildimi? Yarımçıq qalan işləri oldumu? Oldu, deyəsən. Bu gidi dünyanın işlərini bitirib qurtaran heç olmadı yer üzündə...

Millətinə sevgisinin hüdudu yox idi. Xalqının taleyini hər kəslə birgə yaşadı, əzablara dözdü, torpağı ikiyə bölünəndə çatları ürəyindən keçdi.

İlk hekayələrindən başlamış son dram əsərinə qədər keçən ömür yolunda yorub-usanmadan yazıb - yaratdı. 1939-cu ildə şəhərə cavabı gəlməyəcəyini bilə-bilə “Kənddən məktublar” yolladı. Amma o məktublar bir qədər gec, dolana-dolana ünvanına çatdı. Mədəniyyətimizə toxunulanda dözmədi, “Tar”ı sinəsinə basıb ağı dedi, haray saldı. İstədi ki, tarın səsi cəbhənin o tayından da eşidilsin. Dərdini deməyə və dinlətməyə kimsə tapmayanda “Qarı dağı”na üz tutdu, çünki dağ göylərə yaxındır. O, təbiətin şah əsərlərindən biridir, onun göylərə qalxan naləsini əks etdirib bütün yer üzünə yayaraq hamının qulağına çatdırmağı təkcə o bacarır. Kimsənin sevgisizlikdən üşüdüyünü biləndə onu qadın əllərinin təması hopmuş “Yun şal”a bürüdü; necə ki “Əsrə bərabər gün” romanında Çingiz Aytmatov Yedigeyi qardan, sazaqdan Zərifənin toxuduğu şarfla qoruya bildi. Fikirləri o qədər zəngin, müşahidəsi o qədər güclü idi ki, yazacaqları bir hekayəyə sığmadı. Ona görə də roman və dram yazdı. Çünki bilirdi ki, ağa qara deməyə alışmış yad qonşular vaxt olacaq torpaqlarımıza

qənim kəsiləcək, hər cür riyakarlığı məsləkə çevirib dünyanı dolandıracaq. Odur ki, düşmən qarşısına əliboş çıxmadı, "Xurşudbanu Natəvan"nın dilində hayqırdı, "Bu torpaq da, onun sərvəti də mənim xalqımındır və onu qarət etməyə heç kəsin haqqı yoxdur!"- dedi.

"Şeyx Xiyabani" bütöv Azərbaycanın azadlığı uğrunda mübarizə apardı. İstədi ki, "Körpüsalanlar" Araz çayı ilə bacını qardaşa, ananı övladına həsrət qoymasın. "Xəncər" düşmənin bağrını dəlsin. İstədi ki, Təbrizdə çalınan toy-düyünün sədası Bakıdan, Daşkəsəndən, Gəncədən gəlsin. İnsanları "İşıqlı yollar"a səslədi, qəlbləri "Bahar suları" kimi coşqun, hərarətli görmək istədi. Arzu etdi ki, xalqını sevən hər kəs ən azından gündə öz-özünə haqq-hesab çəksin, "Mənim günahım" nə idi ki, torpağım düşmən tapdağı altında inləyir? Bu, bir sınaqmı? Axı Azərbaycan xalqı "Büllur sarayda" ömür sürməyə, "Sən ey qadir məhəbbət" söyləyərək bütün dünyaya xeyirxahlıqdan hörülmüş gül çələngi səpməyə layiqdir. Hər ailəni kiçik bir dövlət hesab edən "Atayevlər ailəsi" qanun və düzlükdən başqa bir əqidə tanımadı. Sadəlövhlüyü üçün öz-özünü qınayan "Hökmdar və qızı" "Söyüdlü arx"ın kənarında "Tənha iydə ağacı"na söykənib, "Apardı sellər Saranı" naləsini azından min dəfə pıçıldadı. Onun pıçıltısı nəğməyə döndü, əsrləri adladı, qısa zaman kəsiyində "Mahnı dağlarda qaldı", düzənlərdə əks-səda verdi. İstədi ki, təkcə "Dağlar arxasında üç dost" deyil, bütün millətlər qardaş olsun. Hamı üçün şirin bir nağıl yazdı, o yalnız "Valehlə Sarıköynəyin nağılı", "Xan qızı Gülsənubərlə Tarzən Sadıqcanın nağılı" deyildi, həm də "Qəribə oğlan"larındır. Arzu etdi ki, analar layla ilə birgə balalarına "Qəhrəman ilə bülbülün nağılı"nı da söyləsinlər. Heç kəs qəmlə dolu "Məhv olmuş gündəliklər"i təəssüflə vərəqləməsin, xoşbəxtliklər "Kiçik bir poema"ya sığmasın, gözlərdə heç vaxt "İntizar" olmasın, heç kəs "Unuda bilmirəm"- deyərək əzab çəkməsin, insanlar bir-birilərinə yalnız xoş sözlər desinlər, sevgililər üçün "Sən həmişə mənimləsən" ifadəsi adiləşməsin, öz dəyərində qalsın. "Cavan yolçu" "Görüş"ünə gəldiyi "Gülaçarla" bütöv bir ömür yaşasın. Qoy bütün dünyada "Yarımçıq qalmış portret haqqında mahnı" əsərin bitmədiyi üçün təəssüf doğurmasın. "Yaylaq qonşumuz" "Durna"nın taleyinə biganə qalmasın. Hətta "Qəhrəmanımın nişanlısı" da "Şəhərdən gələn ovçu"ya ehtiram və hörmətdə müəllifin fikrini yanıltmasın. "Tufandan sonra" açılan hava qaranlığın qarşısına "Daş hasar" çəksin, "Həyatın əbədi ahəngi" dəyişməsin, "Aydınlıq gecələr"i qara buludlar qoynuna almasın, qələbə xəbərinin ilk müjdəçisi "Sağsağan" olsun. Hər kəsin həyatından geridə yalnız xoş "Xatirələr" qalsın.

Hər açılan sabahın ilk dəqiqələrindən üzünü səmalara tutub xalqı, milləti üçün dualar edən İlyas Əfəndiyev "Sən ey böyük yaradan", biz Sənin qullarınıq, bizlərdən heç kəsə bir daha "Qaçaq Süleymanın ölümü"nü nəsib etmə, kimsə namərd gülləsinə qurban getməsin. Qoy yer üzünün dilbər guşəsi olan "AZƏRBAYCAN dünyaya günəş kimi doğsun", onun al şəfəqləri altında eşidəcəyimiz səs körpə gülüşləri, görəcəklərimiz isə yalnız toy-düyünlər olsun!".

